## ƏHKƏM

***əl-Əhkəm* - *“Məgər Allah hakimlərin hakimi*** *(ən ədalətli, ən üstün hakim)* ***deyilmi?!”.*** *(ət-Tin 8).* ***Nuh Rəbbinə*** *(dua ilə)* ***müraciət edib dedi: “Ey Rəbbim! Oğlum*** *(Kənan)* ***mənim ailə üzvlərimdəndir. Sənin vədin, sözsüz ki, haqdır. Sən hakimlərin hakimisən!”.*** *(Hud 45).* İsim olaraq deyil, yalnız bu ayələrdə izafə olaraq keçir ***Əhkəmul Həkimin***.

***Kim Zikr Edib:*** İbn Həzm, İbn Vəziri – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## Ə’ZAM

***əl-Ə’zam –*** Nə İzafə, nə də İsim olaraq keçməz. ***əl-Azim –*** İsmindən alınmışdır.

***Kim Zikr Edib:*** İbn Vəziri – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## Ə’LƏM

***əl-Ə’ləm –*** İsim olaraq deyil, yalnız Fel olaraq keçir. ***“Halbuki, Allah onların (bütün) gizlətdiklərini çox yaxşı bilir!”.*** *(Ali İmran 167).*

***Kim Zikr Edib:*** İbn Vəziri – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## ƏQRAB

***əl-Əqrab –*** İsim olaraq deyil, yalnız Fel olaraq keçir. ***“Biz ona sizdən daha yaxınıq, amma siz*** *(bunu)* ***görmürsünüz!”.*** *(əl-Vaqiə 85).*

***Kim Zikr Edib:*** İbn Vəziri – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## ƏQVƏ

***əl-Əqvə*** - Ola bilər ki, bu ayədən götürülüb. ***“Ad qövmünə gəlincə, onlar yer üzündə nahaq yerə təkəbbür göstərib dedilər: “Bizdən daha qüvvətli kim ola bilər?!” Məgər onlar düşünmədilərmi ki, özlərini yaratmış olan Allah onlardan daha qüvvətlidir?! Onlar ayələrimizi inkar edirdilər”.*** *(Fusillət 15).*

***Kim Zikr Edib:*** İbn Vəziri – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## ƏKBƏR

***əl-Əkbər –*** Peyğəmbər 3 buyurdu: “***Allahu Əkbər, Allahu Əkbər, Həsbiyallahu Və Niməl Vəkil, Allahu Əkbər, əl-Əkbər***”[216].

[216] Əbu Davud 2/174, 1508.

***Kim Zikr Edib:*** İbn Həzç, Qurtubi, İbn Vəziri – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## ƏMİN

***əl-Əmin –*** Dəlili yoxdur. İbn Qeyyim Σ deyir ki: "***Əmin –*** Allahın İsimlərindən deyildir"[217].

***Kim Zikr Edib:*** Qurtubi,– *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## BƏDİ

***əl-Bədi*** - İsim olaraq deyil, yalnız Fel olaraq keçir. ***"Göyü kitab səhifəsi kimi büküb qatlayacağımız günü*** *(Qiyamət gününü)* ***yadınıza salın.*** *(O gün insanları)* ***ilk dəfə*** *(yoxdan)* ***yaratdığımız kimi qaytarıb*** *(dirildib)* ***əvvəlki halına salarıq...".*** *(əl-Ənbiya 104).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## BƏRR

***əl-Bərr –*** İsim olaraq gəlməyib, bu hədisdən götürülüb. Peyğəmbər 3 buyurdu: "Allahın qullarından elələri vardır ki, Allaha and içsə Allahı onun andını yrtinə yetirir"[218].

***Kim Zikr Edib:*** İbn Məndə – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## BƏİS

***əl-Bəis –*** Bu İsim Quranda Fel olaraq zikr edilir. ***«Bəlkə şükr edəsiniz deyə biz sizi sonra yenidən diriltdik*** *(BƏİS)».* *(əl-Bəqərə 56).* ***«Şübhə yox ki, Allah qəbirlərdə olanları dirildəcəkdir».*** *(əl-Həcc 7).* ***"Allah onların hamısını dirildəcəyi gün onlar sizə*** *(yalandan)* ***and içdikləri kimi, Allaha da and içəcək və*** *(bununla axirətdə)* ***bir şey qazanacaqlarını zənn edəcəklər. Bilin ki, onlar əsl yalançıdırlar!".*** *(əl-Mucadələ 18).* Bu İsim diriltmək, ruh vermək, bədənləri yenidən diriltmək, bir şeyə həyat vermək deməkdir. Bəzən də Peyğəmbər göndərən. ***«And olsun ki, biz hər ümmətə Allaha ibadət edin və tağutdan çəkinin deyə Peyğəmbər göndərdik*** *(BƏİS)».* *(ən-Nəhl 36).* Qul öyrənmək üçün səy göstərərsə sanki ruhu ölümdən sonra yenidən dirilməkdədir. Elmi cahil kimsələrə öyrətdikcə sanki onların ruhlarını ölümdən sonra təkrar diriltməkdədir[219].

---

[217] "Fəvaid" 2/143.
[218] Buxari 2703, Müslim 3/1302, H. 24.
[219] Qurtubi «əl-Əsmə» 1/478.

***Kim Zikr Edib:*** Cəfər Sadiq, İbn Məndə, Həlimi, Beyhəqi, Qurtubi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# BĀTİŞ

***əl-Bātiş* -** İsim olaraq deyil, yalnız Fel olaraq keçir. ***"Həqiqətən, sənin Rəbbinin intiqamı çox şiddətlidir!".*** *(əl-Buruc 12).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# BƏLİ

***əl-Bəli* –** İsim olaraq deyil, yalnız Fel olaraq keçir. ***"Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq*** *(bəlli etmək)* ***üçün ölümü və həyatı yaradan Odur. O, yenilməz qüvvət sahibidir,*** *(çox)* ***bağışlayandır".*** *(əl-Mulk 2).*

***Kim Zikr Edib:*** İbn Arabi, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# BƏNİ

***əl-Bəni* -** İsim olaraq deyil, yalnız Fel olaraq keçir. ***"Biz göyü qüdrətimizlə*** *(qüdrət əlimizlə)* ***yaratdıq və Biz*** *(istədiyimiz hər şeyi yaratmağa)* ***qadirik.*** *(Və ya: Biz göyü qüdrətimizlə yaratdıq və Biz onu genişləndirməkdəyik)****".*** *(əz-Zariyat 57).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# BURHƏN

***əl-Burhən* – "Bu, Firona və onun əyanlarına qarşı sənin Rəbbindən olan iki tutarlı dəlildir".** *(əl-Qəsəs 32).* ***"Ey insanlar!*** *(Bu Muhəmməd)* ***sizə Rəbbiniz tərəfindən dəlil gəlmişdir. Biz sizə aydın bir nur*** *(Quran)* ***endirdik".*** *(ən-Nisa 174).* İsim kimi gəlməyib. *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** Cəfər Sadiq, Qurtubi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# TƏMM

***ət-Təmm* -** *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# CƏƏİLU

***əc-Cəəilu*** **-** İsim olaraq deyil, yalnız bu ayədə izafə olaraq keçir. ***“Göyləri və yeri yoxdan yaradan, ikiqanadlı, üçqanadlı və dördqanadlı mələkləri*** *(peyğəmbərlərə)* ***elçi edən Allaha həmd olsun!*** *(Allah)* ***məxluqatda istədiyini artırar. Həqiqətən, Allah hər şeyə qadirdir!”.*** *(Fatir 1).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# HƏƏSİB

***əl-Həəsib – “Allah tezliklə haqq-hesab çəkəndir”.*** *(ən-Nur 39).*

***Kim Zikr Edib:*** Qurtubi, İbn Vəzir, Həmud, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# HƏƏKİM

***əl-Həəkim – “Şübhəsiz ki, Allah istədiyini hökm edər!”.*** *(əl-Məidə 1).* ***əl-Həkəm, əl-Həkim*** İsimləri isim olaraq keçir, lakin ***əl-Həəkim*** yox[220].

***Kim Zikr Edib:*** İbn Vəzir, Həmud, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# HƏNNƏN

***əl-Hənnən –*** Ənəs İbn Məlik K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: “Kişi Cəhənnəmdə **1000** il nida (səsləyərək) deyəcəkdir: “***Yə Hənnən, Yə Mənnən...***”[221].

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, Qurtubi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# XATİM

***əl-Xatim – “****(Ya Rəsulum!)* ***De: “Bir deyin görüm, əgər Allah sizin qulaqlarınızı və gözlərinizi əlinizdən alsa, ürəklərinizə möhür vursa, onları sizə Allahdan qeyri hansı tanrı qaytara bilər?” Gör Biz ayələrimizi onlara necə izah edirik, sonra onlar ondan gör necə üz döndərirlər”.*** *(əl-Ənam 46).* İsim olaraq deyil, yalnız Fel olaraq keçir.

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

---

[220] Qurtubi “Təfsir” 7/70.

[221] Beyhəqi “Əsməu və Sifət” 105,106.

# XAFİ

***əl-Xafi* –** Dəlilini tapmadım. Qurtubi Σ deyir ki: "Bəzi hədislərdə keçir"[222].

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# XALİFƏTU

***əl-Xalifətu* –** İsim olaraq deyil, yalnız Xəbər formasında keçir. İbn Ömər K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: ***(Allahu Əkbər, Allahu Əkbər, Allahu Əkbər). Subhanəlləzi Səxxara Lənə Həzə Və Mə Kunnə Ləhu Muqrinin, Və İnnə İlə Rabbinə Ləmunqalibun, Allahummə Innə Nəs'alukə Fi Səfərinə Həzə Əl-Birra Vət-Təqva, Və Minəl Aməli Mə Tərda, Allahummə Həvvin Aleynə Səfəranə Həzə Vətvi Annə Bu'dəhu, Allahummə Əntəs-Sahibu Fis-Səfəri Vəl-Xaliyfətu Fil-Əhli. Allahummə Inniy Əuzu Bikə Min Və'sais-Səfəri Və Kəabətil-Mənzari Və Suil-Munqaləbi Fil-Mali Vəl-Əhli* -** «Allah ən Böyükdür, Allah ən Böyükdür, Allah ən Böyükdür. «Bunu bizə tabe edən (Allah) pak və müqəddəsdir. (Yoxsa) bizim ona gücümüz çatmazdı. Şübhəsiz ki, biz Rəbbimizə qayıdacağıq». Allahım! Bu səfərimizdə Səndən yaxşılıq, Allah qorxusu və razı qalacağın əməl diləyirik. Allahım! Bu səfərimizi bizim üçün rahat et və onun uzaqlığını bizə yaxın et. Allahım! Səfərdə dost və ailəmiz üçün hami (***əl-Xalifətu***) Sənsən. Allahım! Səfərin ağırlığından, məyus edən mənzərədən, malda və ailədə xoşagəlməz dəyişiklikdən Sənə pənah aparıram»[223].

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# DƏHR

***əd-Dəhr* –** Allahın İsimlərindən deyildir. Zaman və Vaxtdır. Əbu Hureyrə K rəvayət edir ki, Peyğəmbər 3 öz Rəbbindən buyurdu: «Adəm oğlu mənə əziyyət verir, zəmanəni söyür (pisləyir). Zaman isə Mənəm. Mən gecə ilə gündüzü bir-biri ilə əvəz edirəm»[224].

***Kim Zikr Edib:*** İbn Həzm – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

---

[222] "Şərh Əsməul Husnə" 425.
[223] Müslim 4/104, 998.
[224] Buxari 8/441, 13/389, Müslim 2246.

# DƏFİ’

***əd-Dəfi’* – “Şübhəsiz ki, Allah iman gətirən kəslərdən** *(kafirlərin əzab-əziyyətini)* **dəf edər. Allah, həqiqətən, heç bir xaini, nankoru sevməz!”.** *(əl-Həcc 38).* İsim olaraq deyil, yalnız Fel olaraq keçir.

***Kim Zikr Edib:*** İbn Məndə – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# ZƏRİ

***əz-Zəri* – *“Göyləri və yeri yoxdan yaradan*** *(Allah)* ***sizin üçün özünüzdən*** *(öz cinsinizdən)* ***zövcələr, heyvanlardan da*** *(erkək və dişi olmaqla özləri üçün)* ***ciftlər yaratmışdır. O sizi bu minvalla çoxaldır. Ona bənzər heç bir şey yoxdur. O,*** *(hər şeyi)* ***eşidəndir,*** *(hər şeyi)* ***görəndir!”.*** *(əş-Şura 11).* İsim olaraq deyil, yalnız Fel olaraq keçir.

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# RĀŞİD - RAŞİD

***ər-Rāşid – ər-Raşid – Raşədə*** felindən törənmişdir doğruluğa yönəldən, doğruluq sahibi deməkdir. ***«Ey Rəbbimiz! Bizə öz dərgahından mərhəmət bəxş et və işimizə fərəc ver*** *(RĀŞİD)****».*** *(əl-Kəhf 10).* Bu isimlər insanlar üçün də istifadə edilə bilər. ***«Allahın doğru yola saldığı kəs doğru yoldadır. Allahın yoldan çıxartdığı şəxsə isə əsla doğru yolu göstərən bir rəhbər tapa bilməzsən*** *(MURŞİD)****».*** *(əl-Kəhf 17).* ***«Məgər aranızda ağlı başında olan bir adam yoxdur*** *(RĀŞİD)****».*** *(Hud 78).* ***«Sən doğurdan da həlim xasiyyətli və çox ağıllısan*** *(RAŞİD)****».*** *(Hud 87).* Peyğəmbər 3 buyurdu: «Hər kim Allah və Rəsuluna itaət edərsə doğru (*RAŞİD*) yolu tapmışdır. Hər kim də bu ikisinə asi olursa heç şübhəsiz ki, azmışdır»[225]. Bu hədisdə doğruluğun və rüşdün Allaha və Rəsuluna itaət etməkdə olduğunu bildirməkdədir. Buna görə də hər bir müsəlman Allahın qullarına doğru yolu göstərməli və onları İslama uyğun olmayan, onları ibadət və itaətdən uzaqlaşdıran, Allah və Rəsuluna üsyan etmələrinə, əmr və qadağalarını aşmağa aparan bütün adət və ən-ənələri tərk etməyə çağırmalıdır.

***Kim Zikr Edib: ər-Rāşid –*** Qurtubi, Şərbsi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

***Kim Zikr Edib: ər-Raşid –*** İbn Məndə, Həlimi, Beyhəqi, İbn Arabi, Qurtubi, İbn Vəzir, Səədi, Şərbasi, Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

[225] Müslim 870.

# RAMADAN

***ər-Ramadan* –** Əbu Hureyrə K deyir ki: “Ramazan deməyin. Çünki Ramazan Allahın İsimlərindən bir İsimdir. Lakin deyin Ramazan ayı”[226].

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# RADI - RIDA

***ər-Radı - ər-Rıda – “Allah onlardan, onlar da Allahdan razıdırlar. Bu,*** *(möminlər üçün)* ***böyük qurtuluşdur*** *(uğurdur)!****”.*** *(əl-Maidə 119).* İsim olaraq deyil, yalnız Fel olaraq keçir. Sifət babından.

***Kim Zikr Edib: ər-Rıda* -** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

***Kim Zikr Edib: ər-Radı* –** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# ZƏRİ’

***əz-Zəri*’ *– “Onu bitirən sizsiniz, yoxsa Biz?!”.*** *(əl-Vaqiə 64).*

***Kim Zikr Edib:*** İbn Vəzir – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# SƏƏMİ’

***əs-Səəmi’ – “Həqiqətən, Allah*** *(hər şeyi)* ***eşidəndir,*** *(hər şeyi)* ***görəndir!”.*** *(əl-Mucadələ 1).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# SƏRİ’

***əs-Səri’ – “Allah tezliklə haqq-hesab çəkəndir!”.*** *(əl-Bəqərə 202).*

***Kim Zikr Edib:*** Cəfər Sadiq, İbn Məndə, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# SƏQİ

***əs-Səqi – “Və onları etdikləri səbr müqabilində Cənnətlə və*** *(geyəcəkləri)* ***ipəklə mükafatlandıracaqdır”.*** *(əl-İnsan 12).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

---

[226] İbn Kəsir 1/310, Zəif hədis.

# SƏXİTA

***əs-Səxita* – *"Onların*** (*kitab əhlinin*) ***bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən. Gör nəfslərinin əvvəlcədən onlar üçün hazırladığı şey*** *(küfr)* ***necə pisdir ki, Allahın onlara qəzəbi tutmuşdur. Onlar əbədi əzaba düçar olanlardır!".*** *(əl-Maidə 80).*

***Kim Zikr Edib:*** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# ŞƏƏHİD

***əş-Şəəhid* - *«Allah özündən başqa heç bir ilah olmadığına şahidlik etdi».*** *(Ali İmran 18).*

***Kim Zikr Edib:*** İbn Məndə, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# ŞƏFİ'

***əş-Şəfi'* – *"Sizin Ondan başqa heç bir haminiz və şəfaət*** (*əzabı dəf*) ***edəniniz yoxdur. Məgər öyüd-nəsihət qəbul etməyəcəksiniz?".*** *(əs-Səcdə 4).*

***Kim Zikr Edib:*** İbn Arabi, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# ŞƏRİ'

***əş-Şəri'* – *"*** *(Ya Peyğəmbər!)* ***Allah: "Dini doğru-dürüst tutun*** *(qoruyub saxlayın),* ***onda ayrılığa düşməyin!" – deyə Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya, və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi. Sənin dəvət etdiyin*** *(tövhid dini)* ***müşriklərə ağır gəldi. Allah istədiyi kimsəni özünə*** *(peyğəmbər)* ***seçər və tövbə edib Ona tərəf qayıdan kimsəni də doğru yola yönəldər!".*** *(əş-Şura 13).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# SAHİB

***əs-Sahib*** **-** İsim olaraq deyil, yalnız Xəbər formasında keçir. İbn Ömər K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: ***(Allahu Əkbər, Allahu Əkbər, Allahu Əkbər). Subhanəlləzi Səxxara Lənə Həzə Və Mə Kunnə Ləhu Muqrinin. Və İnnə Ilə Rabbinə Ləmunqalibun. Allahummə İnnə Nəs'ələkə Fi Səfərinə Həzə Əl-Birra Vət-Təqva, Və Minəl Aməli Mə Tərda. Allahummə Həvvin Aleynə Səfərənə Həzə Vətvi Annə Bu'dəhu. Allahummə Əntəs-Sahibu Fis-Səfəri Vəl-Xaliyfətu Fil-Əhli. Allahummə Inniy Əuzu Bikə Min Və'sais-Səfəri Və Kəabətil-Mənzari Və Suil-***

***Munqaləbi Fil-Mali Vəl-Əhli* -** «Allah ən Böyükdür, Allah ən Böyükdür, Allah ən Böyükdür. «Bunu bizə tabe edən (Allah) pak və müqəddəsdir. (Yoxsa) bizim ona gücümüz çatmazdı. Şübhəsiz ki, biz Rəbbimizə qayıdacağıq». Allahım! Bu səfərimizdə Səndən yaxşılıq, Allah qorxusu və razı qalacağın əməl diləyirik. Allahım! Bu səfərimizi bizim üçün rahat et və onun uzaqlığını bizə yaxın et. Allahım! Səfərdə dost (***əs-Sahib***). və ailəmiz üçün hami (***əl-Xalifətu***) Sənsən. Allahım! Səfərin ağırlığından, məyus edən mənzərədən, malda və ailədə xoşagəlməz dəyişiklikdən Sənə pənah aparıram»[227].

***Kim Zikr Edib:*** İbn Məndə, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# SANİ'

***əs-Sani' – "Bu, hər şeyi bacarıqla*** *(yerli-yerində)* ***edən Allahın gördüyü işdir".*** *(ən-Nəml 88).* İsim olaraq deyil, Xəbər və Fel olaraq keçir[228].

***Kim Zikr Edib:*** İbn Məndə, Həlimi, Beyhəqi, Əsbəhani, Şərbasi, Sıddıq Həsən Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# SABUR

***əs-Sabur* –** Bu İsim Qurani Kərimdə deyil, hədislərdə keçir. Əbu Musa əl-Əşari K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: «Allahdan daha çox səbrli heç kimsə yoxdur. Çünki Ona şərik qoşulur və övlad isnad edərlər. Sonra yenə də O, bu kimsələri ruziləndirər və onları salamat edər»[229]. ***«Müşriklər Allah özünə övlad götürmüşdür – dedilər. Siz doğurdan da olduqca pis bir iş gördünüz. Buna görə az qaldı ki, göylər parçalansın, yer yarılsın və dağlar yerindən qopub uçsun! Müşriklərin Allaha övlad isnad etdiklərinə görə».*** *(Məryəm 88-91).* Uca Allahın Səbr sifəti qullarının səbrindən fərqlənir. Onun səbri bir çox tərəfdən qullarının səbrinə bənzəməz. Uca Allahın səbri tam bir qüdrətə sahibdir. Qulların güc və qüvvətləri müəyyən həddlər çərçivəsindədir. Bu səbəblə də hər dilədiklərini edə bilməzlər. Səbr etməsi ilə Allah heç bir acı və üzüntü hiss etməz. Heç bir tərəfdən nöqsanlığı olmaz. Lakin insan isə səbr əsnasında acı, üzüntü və sıxıntı keçirir. Allah səbr edənlərə mükafatını hesabsızca

[227] Müslim 4/104, 998.
[228] "Fəvaid" 1/161.
[229] Buxari «Ədəb» 71, Müslim 2804.

verəcəyi ilə müjdələmiş və onları tərif etmişdir[230]. Onun səbri ilə qullarının səbri, Onun diri olması ilə qullarının diri olması, Onun bilməsi ilə qullarının bilməsi, Onun eşitməsi ilə qullarının eşitməsi arasında fərq kimidir. Əbul Aliyə Σ deyir ki: «Səbr edənlər dünya və axirət sevincini əldə edib Allah ilə bərabər olma şərəfinə nail olmuşlar”. ***«Şübhəsiz ki, Allah səbr edənlərlə bərabərdir».*** *(əl-Bəqərə 153).* Burada çox incə bir sirr vardır. O, da hər kim Allahın sifətlərindən bir sifətə sarılacaq olursa o, sifətin o, kimsəni Allaha yaxınlaşdırmasıdır. Uca Allah İsimlərini və Sifətlərini sevdiyi kimi bunların izlərini də qullarında görməsini də sevər. Çünki Allah gözəldir və gözəl olanı da sevər, Allah bağışlayandır və bağışlayanları da sevər, Allah alimdir və elm əhlini də sevər, Allah təkdir və tək olanı da sevər, Allah qüvvətli və güclüdür və güclü mömini də zəif mömindən daha çox sevir, Allah əs-Səburdur və səbr edən qullarını da sevər, Allah əş-Şəkurdur və şükr edən qullarını da sevir.

***Allah Uğrunda Olan Səbr - Allahla Bərabər Olan Səbr*** – səbrin ən yüksək mərtəbəsidir ki, buna da ***Vəfa*** ismini vermişlər. Allahı sevməsi və Ondan gələn hər şeyə razı olması deməkdir. Bu məna doğrudur və səbrin üç növünü də özündə əhatə edir. AbdurRahmən əs-Səədi Σ deyir ki: «Səbr Allah haqqında işlədildikdə mənası: Uca Allahın düşmənlərinin Onu söyməl əri, yalanlamaları, Peyğəmbərlərini yalanlama-ları, Ona övlad nisbət etmələri, şirk qoşmalarına baxmayaraq onlara əzab verməkdə tələsməyən, onlara qarşı nemətlərini verməsi, ruzilərini bol-bol verməsidir. Uca Allahın səbri ən mükəmməl səbrdir. Qüdsi hədislərin birində: Allah Ψ buyurur: «Mən yaradıram, məndən başqasına ibadət edirlər. Mən ruzi verirəm, məndən başqasına şükr edirlər»[231]. Əbu Hureyrə K rəvayət edir ki, Peyğəmbər 3 Uca Rəbbindən buyurdu: «Adəm oğlu məni yalanladı, Mənə uyğun olmayan sözlər söyləyir. Lakin o, belə etmək haqqına sahib deyildir. Onun məni yalanlaması: «Məni ilk yoxdan yaratdığı kimi təkrar məni yaratmayacaqdır» deməsidir. Halbuki təkrar yaratmaq mənim üçün onu ilk yaratmaqdan daha çətin deyildir. Mənə

---

[230] ***Səbr*** – həps etmək deməkdir. Üç növdür. 1. Qəza və Qədər ilə təqdir edilənlərə səbr (bəla, müsibətlər və s). 2. Əmr edilənlərə səbr etmək (namaz, oruc və s). 3. Qadağan edilənlərə səbr (haramlara qarşı səbrli olmaq). ***«Ey iman gətirənlər! Səbr və dua ilə Allahdan kömək diləyin. Allah səbr edənlərlədir».*** *(əl-Bəqərə 153).* ***«Ey iman gətirənlər! Səbr edin, dözün, hazır olun və Allahdan qorxun ki, bəlkə nicat tapasınız».*** *(Ali İmran 200).* ***«And olsun ki, biz içərinizdəki mücahidləri və səbr edənləri ayırd edib bilmək üçün sizi imtahana çəkəcək və əməllərinizi də yoxlayacağıq».*** *(Muhəmməd 31).* ***«Əlbəttə biz sizi bir az qorxu, aclıq, bir az malnan və məhsul qıtlığı ilə imtahan edərik. Səbr edən şəxslərə müjdə ver».*** *(əl-Bəqərə 155).* Ömər K deyir ki: «Biz gözəl həyatı səbrlə hiss etdik» Buxari, Əhməd. Əli K deyir ki: «İmansız səbr başsız adam kimidir. Səbri olmayanın imanı da olmaz». İbn Məsud K deyir ki: «İnam imanın hamısıdır. Səbr isə imanın yarısıdır».

[231] Beyhəqi «Şuabul İman» 4/134.

uyğun olmayan sözlər söyləməsi isə: «Allahın övladı vardır» deməsidir. Halbuki mən təkəm. Samədəm (heç bir şeyə möhtac deyiləm). Doğmadım, doğulmadım. Heç kimsə Mənə oxşar deyildir»[232]. Buna görə də Allah Saburdur. Qullarından səbr edənləri də sevir.

***Kim Zikr Edib:*** Xattabi, İbn Məndə, Həlimi, Beyhəqi, İbn Arabi, Qurtubi, İbn Qeyyim, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# SAFUH

***əs-Safuh – "Siz*** *(Allaha şərik qoşmaqla)* ***həddi aşan bir qövmsünüz deyə,*** *(sizi başlı-başına buraxıb)* ***Quranı sizə təbliğ etməkdən vaz keçməliyikmi?!*** *(Və ya: siz müşriksiniz deyə, sizi adam yerinə qoymayıb Quranla sizə öyüd-nəsihət verməməliyikmi?!)****".*** *(əz-Zuxruf 5).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# TABİB

***ət-Tabib –*** Aişə O rəvayət edir ki, Peyğəmbər 3 xəstələndikdə əlini sinəsinə qoyaraq buyurdu: "Ey insanların Rəbbi! Xəstəliyimi apar. ***Əntə Tabibun, Əntə Şəfi*** - Sən həkimsən, Sən Şəfa verənsən"[233].

***Kim Zikr Edib:*** Xattabi, İbn Məndə, Həlimi, Beyhəqi, İbn Arabi, Qurtubi, İbn Qeyyim, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# TALİB

***ət-Talib –*** Dəlili yoxdur. *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# TABİ'

***ət-Tabi' – "Ancaq varlı olduqları halda*** *(döyüşə getməmək üçün)* ***səndən izin istəyənlər məzəmmətə layiqdirlər. Onlar*** *(cihada getməyib)* ***arxada qalanlarla*** *(qadınlar və uşaqlarla)* ***bir yerdə qalmağa razı oldular. Allah onların ürəklərini*** *(qazandıqları günaha görə)* ***möhürləmişdir. Buna görə də onlar*** *(başlarına gələcək müsibəti)* ***bilməzlər!".*** *(ət-Tövbə 93).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

---

[232] Buxari «İxlas Surəsi Təfsiri» 1, Nəsəi 4/112, Musnəd 2/317,350.
[233] Əbu Davud 2407, Əhməd "Musnəd" 6/107.

# TAHİR

***ət-Tahir* -** Dəlili yoxdur. *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** İbn Məndə – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# ĞIYƏS

***əl-Ğıyəs* -** İsim olaraq deyil, Xəbər formasında keçir. Ənəs K rəvayət edir ki, Peyğəmbər 3 əllərini səmaya qaldıraraq buyurdu: "Allahummə! Bizə yağış yağdır, Allahummə! Bizə yağış yağdır"[234].

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# ĞUYUR

***əl-Ğuyur* –** Sifət olaraq hədisdə keçir. Əbu Hureyrə K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Şübhə yox ki, Allah qısqanır. Allahın qısqanması mömin bir qulun Allahın haram (qadağan) etdiyi şeyləri etməsi ilədir»[235].

***Kim Zikr Edib:*** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# FATİH

***əl-Fatih* –** Səhih olan ***əl-Fəttəh*** İsmidir. ***"Allahın insanlara əta etdiyi mərhəmətə** (verdiyi nemətə, ruziyə) **heç kəs mane ola bilməz. Onun vermədiyi bir şeyi də Özündən başqa heç kəs göndərə** (verə) **bilməz. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!".** (Fatir 2).*

***Kim Zikr Edib:*** İbn Məndə, İbn Vəzir, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# FATİN

***əl-Fatin* –** İsim olaraq deyil, Fel olaraq keçir[236]. ***"And olsun ki, Biz Süleymanı** (etdiyi bir xəta üzündən) **imtahana çəkdik. Taxtının üstünə** (ruhsuz) **bir cəsəd atdıq** (və ya: taxtının üstünə bir cin oturtduq). **Sonra o** (peşman olub tövbə etdi və yenidən öz mülkünə, öz taxtına) **qayıtdı".** (Sad 34).*

***Kim Zikr Edib:*** İbn Arabi, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

---

[234] Buxari 1014.
[235] Buxari 5223.
[236] "Fəvaid" 1/161, "Mədaricus "Salikin" 3/410.

# FAİL

***əl-Fail –*** İbn Qeyyim Σ deyir ki: “Allah Özünü Fail olaraq adlandırmayıb”[237]. ***“Göyü kitab səhifəsi kimi bükük qatlayacağımız günü*** *(Qiyamət gününü)* ***yadınıza salın.*** *(O gün insanları)* ***ilk dəfə*** *(yoxdan)* ***yaratdığımız kimi qaytarıb*** *(dirildib)* ***əvvəlki halına salarıq. Biz yerinə yetirməli olduğumuz vədi mütləq yerinə yetirəcəyik.*** *(Biz Qiyamət günü sizi dirildib lüt-üryan, anadangəlmə vəziyyətdə məhşərə gətirməyi vəd etmişdik. Biz onu mütləq edəcəyik)****”.*** *(əl-Ənbiya 104).*

***Kim Zikr Edib:*** İbn Vazir – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# FƏRD

***əl-Fərd -*** Rəsulullah 3 buyurdu: «Mən Şəhadət edirəm ki, Sən – ***Fərdun – Əhədun – Samədun –*** ”[238].

***Kim Zikr Edib:*** Cəfər Sadiq, Həlimi, Beyhəqi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# FƏ'ALU

***əl-Fə'alu – “O, istədiyini edəndir”.*** *(əl-Buruc 16).*

***Kim Zikr Edib:*** Cəfər Sadiq, Sufyən İbn Uyeynə, Həlimi, Beyhəqi, Qurtubi, İbn Vəzir, Səədi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# QADI

***əl-Qadı –*** İsim olaraq deyil, Fel olaraq keçir. ***“Allah*** *(Qiyamət günü)* ***ədalətlə hökm edər. Ondan*** *(Allahdan)* ***başqa ibadət etdikləri*** *(bütlər)* ***isə heç bir şey hökm edə bilməzlər. Həqiqətən, Allah*** *(hər şeyi)* ***eşidəndir, görəndir!”.*** *(əl-Mumin 20).*

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, İbn Arabi, Qurtubi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# QADİM

***əl-Qadim –*** İbn Teymiyyə Σ deyir ki: “Nə Quranda, nə də Sünnədə İsim olaraq keçməz”[239].

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, İbn Arabi, Qurtubi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

---

[237] “Mədaricus Salikin” 3/410.
[238] “Beyhəqi “Əsməul Husnə” 116-117.
[239] “Minhəc Sunnə” 2/123, “Məcmuul Fətava” 1/245, 300-301.

# QAİM

***əl-Qaim* – “Hər bir kəsin** *(dünyada yaxşıdan, pisdən)* **nə qazandığına nəzarət edən Allah bunu bacarmayan bütlər kimidirmi?!** *(Əsla yox!) (Bununla belə, müşriklər götürüb)* **Allaha** *(cürbəcür)* **şəriklər qoşdular.** *(Ya Rəsulum!)* **De: “Bunlara bir ad verin görək!** *(Axı onlar kimdirlər, nəçidirlər?)* **Yoxsa Allaha yer üzündə** *(özünə şərik)* **bilmədiyi bir şeyimi xəbər verirsiniz? Yaxud sözün zahirinə uyub** *(belə həqiqətdən uzaq şeyləri)* **deyirsiniz? Xeyr, kafirlərə öz hiylələri** *(iftiraları, Allaha qarşı uydurub düzəltdikləri yalanlar)* **gözəl göstərildi və onlar** *(haqq)* **yoldan döndərildilər. Əslində, Allahın zəlalətə saldığı kimsəyə doğru yolu göstərən olmaz”.** *(ər-Rəd 33).*

***Kim Zikr Edib:*** Cəfər Sadiq, Sufyan İbn Uyeynə, İbn Məndə, Əsbəhəni, İbn Vəzir, İbn Həcər, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# QABİL

***əl-Qabil* –** İsim olaraq deyil, İzafə olaraq keçir. ***“Günahları bağışlayan, tövbələri qəbul edən, cəzası şiddətli, kərəmi böyük olan*** *(Allahdandır)!* ***Ondan başqa heç bir tanrı yoxdur. Axır dönüş də Onadır!”.*** *(əl-Mumin 3).*

***Kim Zikr Edib:*** Cəfər Sadiq, Sufyan İbn Uyeynə, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# QİYƏM

***əl-Qiyəm* –** İbn Abbas K rəvayət edir ki, Rəsulullah 3 gecə namazlarına (Təhəccüd) durduqda buyurdu: “***Allahummə Ləkəl Həmdu, Əntə Nurus Səməvəti Vəl Ard, Və Ləkəl Həmdu, Əntə Qiyəmus Səməvəti Vəl Ard –*** Allahummə! Həmd Sənindir (Sənə məxsusdur). Sən Göylərin və Yerlərin Nurusan. Həmd Sənindir. Sən Göyləri və Yerləri (tutub) saxlayansan”[240].

***Kim Zikr Edib:*** İbn Arabi, İbn Məndə – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# QAYYİM

***əl-Qayyim* -** İbn Abbas K rəvayət edir ki, Rəsulullah 3 gecə namazlarında (Təhəccüd) buyurdu: “***Allahummə Ləkəl Həmdu, Əntə Qayyimus Səməvəti Vəl Ard, Bə Mən Fihinnə -*** Allahummə! Həmd Sənindir. Sən Göylərin, Yerlərin və orada olanların İdarəçisisən”[241].

---

[240] İbn Məndə “Tovhid” 2/166, H. 312.
[241] Buxari 1120.

***Kim Zikr Edib:*** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# KƏİN

***əl-Kəin – "Allaha** (özü üçün) **övlad götürmək yaraşmaz. O, pakdır, müqəddəsdir. O, hər hansı bir şeyi yaratmaq istədikdə ona yalnız: "Ol!" deyər, o da dərhal olar".** (Məryəm 35).*

***Kim Zikr Edib:*** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# KƏTİB

***əl-Kətib – "Ayələrimizə iman gətirənlər yanına gəldikdə onlara de: "Sizə salam olsun! Rəbbiniz Özü-Özünə rəhmli olmağı yazmışdır** (bəndələrinə qarşı rəhmli olmağı əzəldən Özü Özü üçün müəyyən etmişdir) **ki, sizlərdən hər kəs pis iş görsə, sonra tövbə edib düzəlsə** (Allah onun günahından keçər). **Şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!".** (əl-Ənam 54).* Nə Fel, nə də İsim olaraq keçməz.

***Kim Zikr Edib:*** Qurtubi, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# KƏŞİF

***əl-Kəşif*** - İsim olaraq deyil, Fel olaraq keçir. ***"Əgər Allah sənə bir zərər toxundursa** (sıxıntı versə), **onu Özündən başqa** (səndən) **heç kəs sovuşdura bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs Onun nemətini** (lütfünü) **geri qaytara bilməz. Allah onu bəndələrindən istədiyinə nəsib edər. O, bağışlayandır, rəhm edəndir".** (Yunus 107).*

***Kim Zikr Edib:*** Həlimi, Beyhəqi, Qurtubi, İbn Vəzir, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MƏƏCİD

***əl-Məəcid*** - Rəsulullah 3 öz Rəbbindən buyurdu: "Həqiqətən Mən - ***Cəvədun – Məəcidun – Samədun -*** "[242].

***Kim Zikr Edib:*** Xattabi, İbn Məndə, Əsbəhani, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MƏNİ'

***əl-Məni'*** - Muğira İbn Şöbə K rəvayət edir ki, Rəsulullah 3 hər fərz namazından sonra belə buyurardı: «Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. O, təkdir. Heç bir şəriki yoxdur. Mülk və Həmd yalnız Ona aiddir. O, hər şeyə qadirdir. ***Ammalummə Lə Mənia Limə Ətəytə Və Lə***

[242] Əhməd "Musnəd" 5/154,177, Tirmizi 2495.

***Mutiyə Limə Mənətə*** - Ey Allahım! Sənin verdiyinə mane olan, mane olduqlarını da verən kimsə yoxdur. Sənin yardım və ehsanın olmadıqca heç kimsənin yardımı fayda verməz»[243].

***Kim Zikr Edib:*** Xattabi, İbn Məndə, Əsbəhani, İbn Qeyyim, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## MUƏLLİF

***əl-Muəllif – “Və onların*** *(birini düşmən Ovs və Xəzrəc qəbilələrindən olan ənsarın)* ***ürəklərini*** *(ülfətlə, dostluqla)* ***birləşdirdi. Əgər sən yer üzündə nə varsa, hamısını xərcləsəydin belə, yenə də onların ürəklərini birləşdirə bilməzdin. Lakin Allah onları birləşdirdi, çünki O, yenilməz qüvvət sahibi, hikmət sahibidir”.*** *(əl-Ənfəl 63).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUƏYYİD

***əl-Muəyyid –*** İsim olaraq deyil, Fel olaraq keçir. ***“Əlbəttə, Allah istədiyinə Özköməyi ilə qüvvət verər”.*** *(Ali İmran 13).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUBARƏK

***əl-Mubarək - “Sizin üçün yeri məskən, göyü tavan edən, sizə surət verən, surətlərinizi gözəlləşdirən, sizə təmiz*** *(pak)* ***nemətlərdən ruzi verən Allahdır! Bu sizin Rəbbiniz olan Allahdır. Aləmlərin Rəbbi olan Allah nə qədər ucadır*** *(nə qədər uludur)! (Ucalardan ucadır, xeyir-bərəkəti bol və daimidir!)”. (əl-Mumin 64).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUBTƏLİ

***əl-Mubtəli – “****(Ya Rəsulum!)* ***Xatırla ki, bir zaman Musa öz tayfasına belə demişdi: “Allahın sizə bəxş etdiyi neməti yadınıza salın, çünki O sizi Firon əhlinin əlindən qurtardı. Onlar sizə dəhşətli əzab verir, oğullarınızı öldürüb, qadınlarınızı*** *(özlərinə xidmət etmək üçün)* ***diri saxlayırdılar. Bunda Rəbbiniz tərəfindən sizin üçün böyük bir imtahan vardır!”.*** *(İbrahim 6).*

***Kim Zikr Edib:*** İbn Arabi, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

---

[243] Buxari 744,3116, Müslim 593.

# MUBRİM

***əl-Mubrim* – “Yoxsa onlar** *(Peyğəmbərə hiylə qurmaqla)* **düzgün iş görmüşdülər?! Elə isə Biz də** *(onlara əzab verməklə)* **düzgün iş görürük!”.** *(əz-Zuxruf 79).*

***Kim Zikr Edib:*** İbn Arabi, Qurtubi, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUBĞİD

***əl-Mubğid*** – İsim deyil, Sifət babındandır. Bəra K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: “***Ənsarı*** – mömindən başqası sevməz, Münafiqdən başqası da onlara nifrət etməz. Kim onları sevərsə Allah onu sevər, kim onlara nifrət edərsə Allah ona nifrət edər”[244].

***Kim Zikr Edib:*** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUBQİ

***əl-Mubqi* – “Sizdə olan** *(dünya malı)* **tükənər, Allah dərgahında olan** *(axirət nemətləri)* **isə əbədidir.** *(Allah yolunda əziyyətlərə)* **dözənləri etdikləri yaxşı əməllərin müqabilində mükafatlandıracağıq** *(yaxud gördükləri yaxşı işlərin əvəzində onlara daha yaxşı mükafat verəcəyik!)***!”.** *(ən-Nəhl 96).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUBLİ

***əl-Mubli* – “***(Ey möminlər Bədrdə)* **onları** *(kafirləri)* **siz öldürmədiniz, Allah öldürdü.** *(Ya Peyğəmbərim! Düşmənlərin gözünə bir ovuc torpar)* **atdığın zaman sən atmadın, Allah atdı. Allah bununla möminləri** *(qənimət əldə etmək və zəfər çalmaq üçün)* **yaxşı bir imtahandan keçirtdi. Allah** *(hər şeyi)* **eşidəndir, biləndir!”.** *(əl-Ənfal 17).*

***Kim Zikr Edib:*** İbn Arabi, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUTƏFƏDDİL

***əl-Mutəfəddil* – “***(Ya Peyğəmbərim!)* **Sən nə iş görsən, Qurandan nə oxusan,** *(ümmətinlə birlikdə)* **nə iş görsəniz, onlara daldığınız** *(onları etdiyiniz)* **zaman Biz sizə şahid olarıq. Yerdə və göydə zərrə qədər bir şey sənin Rəbbindən gizli qalmaz. Ondan daha böyük, daha kiçik elə bir şey də yoxdur ki, açıq-aydın kitabda** *(lövhi-məhfuzda)* **olmasın!”.** *(Yunus 60).*

---

[244] Buxari 3783.

***Kim Zikr Edib:*** Cəfər Sadiq – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUTƏQABBİL

***əl-Mutəqəbbil – "Belələri*** *(dünyadakı)* ***yaxşı əməllərini qəbul edəcəyimiz, günahlarından keçəcəyimiz və onlara verilmiş doğru vədə görə cənnət əhli içərisində olacaq kimsələrdir!".*** *(əl-Əhqaf 16).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUTƏVƏFFİ

***əl-Mutəvəffi – "Allah*** *(əcəli çatan kimsələrin)* ***canlarını*** *(ruhlarını)* ***onlar öldüyü zaman, ölməyənlərin*** *(hələ əcəli çatmayanların)* ***canlarını isə yuxuda alar*** *(çünki yuxu da ölüm kimi bir şeydir, yuxu zamanı ruh bədəni tərk edər)****".*** *(əz-Zumər 42).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUSƏBBİT

***əl-Musəbbit – "Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə*** *(kəlmeyi-şəhadətlə)* ***sabitqədəm edər. Allah zalımları*** *(haqq yoldan)* ***sapdırar. Allah istədiyini edər!".*** *(İbrahim 27).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUCTƏBİ

***əl-Muctəbi – "...Allah istədiyi kimsəni özünə*** *(peyğəmbər)* ***seçər və tövbə edib Ona tərəf qayıdan kimsəni də doğru yola yönəldər!".*** *(əş-Şura 13).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUCİR

***əl-Mucir – "De: "Əgər bilirsinizsə,*** *(bir deyin görək)* ***hər şeyin hökmü əlində olan,*** *(istədiyini)* ***himayə edən, amma Özünün himayəyə ehtiyacı olmayan kimdir?".*** *(əl-Muminun 88).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUHİBB

***əl-Muhibb – "Ey iman gətirənlər! Sizdən hər kəs dinindən dönsə,*** *(bilsin ki)* ***Allah*** *(onun yerinə)* ***elə bir tayfa gətirər ki,*** *(Allah)* ***onları,***

***onlar da** (Allahı) **sevərlər. Onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olar, Allah yolunda vuruşar və heç kəsin tənəsindən qorxmazlar. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah** (öz lütfü ilə) **genişdir,** (O, hər şeyi) **biləndir!”.** (əl-Maidə 54).*

***Kim Zikr Edib:*** İbn Arabi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUHSİ

***əl-Muhsi –*** Bu isim Quranda fel olaraq belə zikr olunur. ***«Allah hər şeyi say olaraq sayıb-təsbit etmişdir».*** *(Cin 28).* Həlimi Σ deyir ki: «***Muhsi –*** Allah insanların ruzi, itaət və günahlarını, hər nəfsi, yağış və qum dənələrini, bütün bitkiləri, heyvan növlərini, ölüləri və canlıları say olaraq bilməkdədir. Qısaca Allah bütün varlıqların sayını, qalanları və yox olanları da biləndir».

***Kim Zikr Edib:*** Xattabi, Həlimi, Beyhəqi, İbn Arabi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUXTƏR

***əl-Muxtər – “Rəbbin istədiyini yaradar və** (istədiyini də peyğəmbər) **seçər. Onların** (bəndələrin istədiklərini etməyə) **heç bir ixtiyarı yoxdur. Allah pakdır, müqəddəsdir və** (müşriklərin) **Ona şərik qoşduqlarından** (bütlərdən) **ucadır!** (Allah eyibsizdir, nöqsansızdır. O, hamıdan uludur!)**”.** (əl-Qəsəs 68).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUXRİC

***əl-Muxric – “**(Allah) **ölüdən diri, diridən də ölü çıxardır, öləndən sonra torpağı dirildir. Siz də** (Qiyamət günü dirildilib qəbirlərinizdən) **belə çıxardılacaqsınız”.** (ər-Rum 19).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUDƏBBİR

***əl-Mudəbbir – “O, göydən yerə qədər olan bütün işləri idarə edir...”.*** *(əs-Səcdə 5).* Həlimi Σ deyir ki: «***Mudəbbir*** – işləri, sonunu gözəl olaraq edən, idarə edən mənasına gəlir. Buna görə də Allah həmişə işlərin sonuna baxar.

***Kim Zikr Edib:*** Xattabi, Həlimi, Beyhəqi, İbn Arabi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUDƏVİL

***əl-Mudəvil* – “Əgər siz** *(Ühüd müharibəsində)* ***yara aldınızsa, o biri*** *(kafir)* ***dəstə də*** *(Bədr müharibəsində)* ***o cür yara aldı. Biz bu günləri*** *(bu hadisələri)* ***insanlar arasında növbə ilə dəyişdiririk ki, Allah iman gətirən şəxsləri*** *(başqalarından)* ***ayırd etsin və içərinizdən şəhidlər*** *(şahidlər)* ***seçsin. Allah zülmkarları sevməz!”.*** *(Ali İmran 140).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUDƏMDİM

***əl-Mudəmdim* – “Lakin onlar** *(Salehi)* ***yalançı saydılar və onu*** *(dəvəni)* ***tutub kəsdilər. Rəbbi də bu günahlarına görə onların kökünü kəsib yerlə yeksan etdi”.*** *(əş-Şəms 14).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MƏZKUR

***əl-Məzkur* –** *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** İbn Arabi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MURSİL

***əl-Mursil* – “Onu** *(İslamı)* ***bütün dinlərdən üstün etmək*** *(onun bütün dinlərdən üstün olduğunu göstərmək)* ***üçün Öz Peyğəmbərini hidayət və haqq dinlə göndərən Odur.*** *(Ya Rəsulum! Sənin peyğəmbərliyinin həqiqiliyinə)* ***Allahın şahid olması kifayət edər!”.*** *(Fəth 28).*

***Kim Zikr Edib:*** Qurtubi, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MURŞİD

***əl-Murşid* –** kəliməsi isə ***Ərşədə*** felindən törənmiş və birinə doğru yolu göstərən deməkdir. ***“****(Ya Rəsulum!)* ***Xatırla ki, o zaman gənclər mağaraya sığınıb: “Ey Rəbbimiz! Bizə Öz dərgahından mərhəmət bəxş et və işimizə fərəc ver!*** *(Bizi kafirlərin bəlasından, düşmənlərin təhlükəsindən qoru, bizə ruzi verib doğru yola yönəlt!)****” – demişdilər”.*** *(əl-Kəhf 10).* ***«Allahın doğru yola saldığı kəs doğru yoldadır. Allahın yoldan çıxartdığı şəxsə isə əsla doğru yolu göstərən bir rəhbər tapa bilməzsən*** *(MURŞİD)****».*** *(əl-Kəhf 17).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## MURİD

***əl-Murid* – “*Biz hər hansı bir şeyi** (yaratmaq) ***istədikdə ona sözümüz: “Ol!” deməkdir. O da dərhal olar”.*** *(ən-Nəhl 40).* İbn Teymiyyə, İbn Qeyyim Σ deyirlər ki: “***Murid* –** Allahın İsimlərindən deyildir”[245].

***Kim Zikr Edib:*** İbn Arabi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## MUSTƏCİB

***əl-Mustəcib – “O zaman siz*** *(dua edərək)* ***Rəbbinizdən kömək diləyirdiniz.*** *(Allah)* ***“Mən sizin imdadınıza bir-birinin ardınca gələn min mələklə çataram!” – deyə duanızı qəbul buyurmuşdu”.*** *(əl-Ənfal 9).*

***Kim Zikr Edib:*** Qurtubi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## MUSTƏQİM

***əl-Mustəqim* –** Dəlil tapa bilmədim. *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUSTƏMİ’

***əl-Mustəmi’ – “*** *(Allah)* ***buyurdu: “Xeyr!*** *(Firon səni əsla öldürə bilməz!)* ***Hər ikiniz möcüzələrinizlə*** *(Fironun yanına)* ***gedin. Şübhəsiz ki, Biz də sizinlə birlikdə*** *(Firon tayfasının nə dediyini)* ***eşidəcəyik!”.*** *(əş-Şüəra 15).*

***Kim Zikr Edib:*** İbn Vəzir – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUSTAFİ

***əl-Mustafi – “Allah mələklərdən də elçilər*** *(Peyğəmbərlər)* ***seçər, insanlardan da. Həqiqətən, Allah*** *(hər şeyi)* ***eşidəndir, görəndir!”.*** *(əl-Həcc 75).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUSTANİ’

***əl-Mustani’ – “Və Mən səni Özümə*** *(Peyğəmbər)* ***seçdim!*** *(Qırx yaşına çatan kimi sənə peyğəmbərlik bəxş edib möcüzələrlə Fironun yanına göndərdim)**”.*** *(Ta ha 41).*

[245] “Şərh Əsfəhaniyyə” səh. 5, “Mədaricus Səlikin” 3/315,316.

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUSLİH

***əl-Muslih – “Biz*** *(Zəkəriyyanın)* ***duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini*** *(doğmağa)* ***qabil bir hala gətirdik. Onlar xeyirli işlər görməyə tələsər*** *(yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar)****, ümid və qorxu ilə*** *(rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq)* ***Bizə ibadət edirdilər. Onlar Bizə müti idilər”.*** *(əl-Ənbiya 90).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUDAİF

***əl-Mudaif – “Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi kimsə üçün bunu qat-qat artırır. Allah*** *(lütfü ilə)* ***genişdir”.*** *(əl-Bəqərə 261).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUDİL

***əl-Mudil – “****(Qorxudan)* ***üz çevirib qaçacağınız gün sizi Allahdan*** *(Allahın əzabından)* ***qoruyan tapılmaz. Allahın yoldan etdiyi kimsəyə də yol göstərən olmaz!”.*** *(əl-Mumin 33).* İbn Qeyyim Σ deyir ki: “Nə İsim, nə Fel, nə də xəbər formasında keçməz...”[246].

***Kim Zikr Edib:*** Qurtubi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUTIM

***əl-Mutım – “****(Ya Rəsulum!)* ***De: “Mən göyləri və yeri yaradan, hamısını bəsləyib Özü bəslənməyən*** *(hamını yedirdib Özü yeməkdən uzaq olan)* ***Allahdan başqasını özümə Rəbbmi edərəm?!” De: “Mənə ilk müsəlman olmaq əmr edildi və müşriklərdən olma!”*** *(deyə buyuruldu)****”.*** *(əl-Ənam 14).*

***Kim Zikr Edib:*** İbn Məndə, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

[246] “Fəvaid” 1/161.

# MUTTALİ’

***əl-Muttali’*** **-** Peyğəmbər 3 buyurdu: «Bədirdə iştirak edən səhabəni, nə bilirsən bəlkə də Allah Bədr əhlinə muttali olub buyurmuşdu: İstədiyinizi edin, Mən sizi bağışladım, Sizə Cənnət vacib oldu»[247].

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUTAHHİR

***əl-Mutahhir – “Ey kitab əhli, nə üçün İbrahim barəsində höcətləşirsiniz? Tövrat da, İncil də ancaq ondan sonra nazil edilmişdir, məgər başa düşmürsünüz?”.*** *(Ali İmran 65).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUZHİR

***əl-Muzhir – “Müşriklərin xoşuna gəlməsə də, onu*** *(İslamı)* ***bütün dinlərin fövqündə*** *(bütün dinlərdən üstün)* ***etmək üçün Öz Peyğəmbərini doğru yolla və haqq dinlə göndərən Odur!”.*** *(ət-Tövbə 33).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUAFİ

***əl-Muafi*** **-** Peyğəmbər 3 buyurdu: “***Allahumməhdiniy Fiymən Hədeyt, Və Afiniy Fiymən Afeyt*** **-** Allahım! Hidayət verdiyin kimsələr arasında mənə də hidayət ver! Salamatlıq bəxş etdiyin kimsələr arasında mənə də salamatlıq bəxş et!...”[248]

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MƏABUD

***əl-Məabud – “Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!”.*** *(əz-Zariyat 56).*

***Kim Zikr Edib:*** İbn Arabi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUAZZİBU

***əl-Muazzibu – “****(Cihada getməməyə görə)* ***kora günah gəlməz, topala-şilə günah gəlməz, bir də xəstəyə günah gəlməz. Kim Allaha və Peyğəmbərinə itaət etsə,*** *(Allah)* ***onu*** *(ağacları)* ***altından çaylar axan***

[247] Buxari 3983.
[248] «Səhih Tirmizi» 1/144, H. 464, «Səhih İbn Macə» 1/194, əl-Albani «İrvaul Ğəlil» 2/172.

***cənnətlərə daxil edər. Kim*** (onlardan) ***üz döndərsə,*** (Allah) ***onu şiddətli bir əzaba düçar edər!”. (əl-Fəth 17).***

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUİN

***əl-Muin*** - Peyğəmbər 3 buyurdu: ***“Allahummə Əinniy Alə Zikrikə, Və Şukrikə, Və Husni Ibadətikə*** - Allahım! Səni zikr etmək, Sənə şükür etmək və Sənə gözəl tərzdə ibadət etmək üçün mənə yardım et!”[249].

***Kim Zikr Edib:*** Cəfər Sadiq – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MU’Tİ

***əl-Mu’ti*** - Muğira İbn Şöbə K rəvayət edir ki, Rəsulullah 3 hər fərz namazından sonra belə buyurardı: «Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. O, təkdir. Heç bir şəriki yoxdur. Mülk və Həmd yalnız Ona aiddir. O, hər şeyə qadirdir. ***Ammalummə Lə Mənia Limə Ətəytə Və Lə Mu’tiyə Limə Mənətə*** - Ey Allahım! Sənin verdiyinə mane olan, mane olduqlarını da verən kimsə yoxdur. Sənin yardım və ehsanın olmadıqca heç kimsənin yardımı fayda verməz»[250].

***Kim Zikr Edib:*** İbn Həzm, Useymin, Qahtani, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUĞNİ

***əl-Muğni – Ğani –*** tam, əksiksiz, ***Muğni –*** isə tamdan da üstün olaraq ifadə edilir. Uca Allah nə zatı ilə, nə də zatı sifətləri ilə heç bir şeyə bağlı deyildir. O, öz varlığı ilə daimidir. Varlığının başqasına bağlı olmaqdan münəzzəhdir. Əksinə varlılıqlar Allaha bağlı və Ona möhtacdırlar. Bu varlılıqlar Allahın var etməsi ilə ancaq var ola bilirlər. Başqalarının yardımına ehtiyacı olan Ğani (zəngin) olmaz. Belə bir şeyin Allah üçün düşünülməsi mümkün deyildir. Bu üzdən O, mütləq Ğanidir. Allah eyni zaman da Muğni (zənginlik verən, zənginləşdirəndir). Lakin hər zənginlik verənin mütləq Ğani olması düşünülməz. Çünki zənginlik verən zəngin olma ehtiyacını duyar. Ehtiyac duyan isə zəngin olmaz. Allah isə zəngin olmağa ehtiyac duymaz. Bu üzdən O, mütləq Ğani və Muğnidir. ***«Ey insanlar! Siz Allaha*** *(qarşı fəqir olan)* ***möhtacsınız. Allah isə Ğani*** *(heç bir şeyə ehtiyacı olmayan)**, Həmiddir».*** *(Fatir 15).*

---

[249] Əbu Davud 2/86, H. 1522, Nəsəi, 3/53, əl-Albani «Səhih Əbu Davud» 1/284.

[250] Buxari 744,3116, Müslim 593.

Allahın qatında ən dəyərli və ən mükəmməl olan varlıq, Ona nöqsansız bir şəkildiə ibadət edən, Ona möhtaclığını heç bir zaman unutmayan, daima Rəbbinə möhtac olduğunu düşünən, bir an belə Ondan üz çevirməyəndir. Peyğəmbər 3 belə qəlbinin Allahın əlində olduğuna, onu dilədiyi tərəfə çevirə biləcəyindən və bu üzdən heç bir şeyə malik olmadığını bilirdi. ***«Əgər biz sənə səbat verməsəydik, yəqin ki, az da olsa onlara uyacaqdın».*** *(əl-İsra 74).* İnsanlar arasında ən zəngin olan Allaha ən çox möhtac olduğunu biləndir.

***Kim Zikr Edib:*** Xattabi, Qurtubi, Səədi, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUĞİS

***əl-Muğis* –** İbn Qeyyim Σ deyir ki: "O, bütün məxluqat üçün Muğis (məxluqatın yardımına gələn). Yenə də darda qalan kimsələrə yardım etməyə icabət edəndir". AbdurRahmən əs-Səədi Σ deyir ki: "***Muğis* - *Gavs*** kəliməsindən törənmiş bir ismi faildir. ***Gavs* –** sıxıntıları yox edən, üzüntüləri aradan qaldıran deməkdir. Buna görə də Uca Allah çətin işlər və müsibətlər anında bütün məxluqatın yardımına gələn (Muğisdir)". Peyğəmbər 3 buyurdu: «Rəbbimiz sıxıntılı vəziyyətin dəyişəcəyi zaman yaxın olmasına rəğmən qullarının ümüdsüzlüyünə və sıxıntılı vəziyyətlərinə baxar, gülməyə davam edər və sıxıntınızın bitməsinin yaxın olduğunu bilir»[251]. ***«Ümüdsüzlüyə düşmələrinin ardından yağışı yağdıran, rəhmətini hər tərəfə yayan Odur».*** *(əş-Şura 28).* Peyğəmbər 3 buyurdu: «Allah dərd içində olan kimsələrə yardım etməyi sevər»[252]. Buna görə də kim sıxıntılı anında Allahdan yardım diləyərsə, Allah o kimsəyə sıxıntılı halında yardım edər və onu kədərdən qurtarır.

***Kim Zikr Edib:*** Əsbəhəni, Qurtubi, İbn Qeyyim, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUFTİ

***əl-Mufti* – "***(Ya Rəsulum!)* **Səndən fətva istəyirlər. De: "Atası və övladı olmayan şəxs** *(şəxsin mirası)* **haqqında Allah sizə belə fətva verir...".** *(ən-Nisa 176).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

[251] İbn Kəsir «Təfsiru Quran» 1/259, İbn Məcə «Muqəddimə» 13, Əhməd 4/11, Təbərani «Mucəmul Kəbir» 19/207, İbn Əbu Asim «Sünnət» 1/244, Taylasi «Musnəd» 1/147.
[252] Əbu Yala «Musnəd» 7/147, Beyhəqi «Şuabul İman» 2/254, 6/116.

# MUFƏRRİC

***əl-Mufərric* -** Əbu Hureyrə K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: «Hər kim bir mömini dünya sıxıntılarının birindən qurtararsa, Allah onu Qiyamət gününün sıxıntılarının bir sıxıntısından qurtarar..."[253].

***Kim Zikr Edib:*** İbn Məndə – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUFƏDDİL

***əl-Mufəddil* – *"(Ya Rəsulum!)* *Bu peyğəmbərlərin bəzisini digərindəm üstün etdik".*** *(əl-Bəqərə 253).*

***Kim Zikr Edib:*** İbn Məndə, Qurtubi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUFNİ

***əl-Mufni* –** Dəlil tapa bimədim. *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUQSİT

***əl-Muqsit* – *"Biz qiyamət günü üçün ədalət tərəzisi quraraq. Heç kəsə əsla haqsızlıq edilməz. Bir xardal dənəsi ağırlığında olsa belə onu*** *(hər hansı bir əməli tərəziyə)* ***gətirərik. Haqq-hesab çəkməyə Biz kifayətik".*** *(əl-Ənbiya 47).* Əbu Musa əl-Əşari K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Allah yatmır. Ona yatmaq yaraşmaz. Mizanı (Başqa rəvayətdə: Ədaləti) endirsin və ya qaldırsın. Gündüzün əməlindən əvvəl gecənin əməli, gecənin əməlindən əvvəl gündüzün əməli ona (Allaha) yüksəlir (qaldırılır) Onun örtüyü (pərdəsi, hicabı) nurdur. (Əbu Bəkr K nun rəvayətində pərdəsi atəşdir). Əgər üzündəki pərdəni qaldırsa üzünün nurları yaratdığı hər bir şeyi yandırar»[254].

***Kim Zikr Edib*:** Xattabi, İbn Məndə, Həlimi, Beyhəqi, Əsbəhəni, İbn Arabi, Qurtubi, İbn Qeyyim, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUQADDİR

***əl-Muqaddir* – *"Biz*** *(nütfədən insan yaratmağa)* ***qadir olduq. Nə gözəl qadir olanlarıq Biz!".*** *(əl-Mursələt 23).*

---

[253] Buxari 2442, Müslim 8/18, 2698.

[254] Müslim 179/293, İmam Əhməd 4/395,401, İbn Məcə 195, Darimi «ər-Rədd aləl Mərisi» s. 173, Beyhəqi «Əsmə və Sifət» s. 402, əl-Albani «Muhtasarul Uluvv» s. 86, «Səhih Cəmius Səğir» 1860.

***Kim Zikr Edib:*** İbn Məndə, İbn Arabi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUKRİM

***əl-Mukrim – "Biz, Adəm övladını şərəfli və hörmətli elədik, onları suda və quruda*** *(gəmilərə, heyvanlara və başqa nəqliyyat vasitələrinə)* ***mindirib sahib etdik, özlərinə*** *(cürbəcür nemətlərdən)* ***təmiz ruzi verdik və onları yaratdığımız məxluqatın çoxundan xeyli üstün etdik.*** *(İnsan şüur, nitq qabiliyyəti, gözəl surət, boy-buxun, əllə yemək və s. bu kimi məziyyətlərinə görə həmişə Allaha şükür edib yalnız Ona tapınmalı, Rəbbinə heç bir şərik qoşmamalıdır!)****".*** *(əl-İsra 70).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUMTƏHİN

***əl-Mumtəhin – "Həqiqətən, Allahın Peyğəmbəri yanında astadan danışanlar*** *(səslərini asta çıxardanlar)* ***o kimsələrdir ki, Allah onların ürəklərini təqva üçün imtahana çəkmişdir*** *(möminliyə layiq etmişdir).* ***Onları*** *(günahlardan)* ***bağışlanma və böyük mükafat*** *(Cənnət)* ***gözləyir!".*** *(əl-Hucurat 3).*

***Kim Zikr Edib:*** Qurtubi, İbn Arabi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUMİDD

***əl-Mumid – "****(Bundan)* ***sonra sizə onların üzərində təkrar zəfər çaldırdıq,*** *(yenidən)* ***var-dövlət, oğul-uşaq verməklə kömək göstərdik və sayca sizi*** *(əvvəl olduğunuzdan və ya düşmənlərinizdən)* ***daha çox etdik".*** *(əl-İsra 6).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUMLİ

***əl-Mumli – "Mən onlara möhlət verirəm. Lakin dolaşdırıb bəla toruna salmağım da*** *(naz-nemət içində yaşadıqları halda gözlənilmədən onları əzabla yaxalamağım da)****, sözsüz ki, çox ağırdır!".*** *(əl-Əraf 183).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUMHİL

***əl-Mumhil – "Elə isə*** *(ya Peyğəmbər!)* ***kafirlərə möhlət ver! Onlara azacıq möhlət ver!".*** *(ət-Tariq 17).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUNTƏQİM

***əl-Muntəqim* –** İbn Teymiyyə Σ deyir ki: "***Muntəqim* –** Allahın İsimlərindən deyildir"[255]. İntiqam alan deməkdir. Allaha üsyan edənlərin belini qıran, əmr və qadağalarını aşanları şiddətli cəzalarla cazalandırandır. Onun intiqamı tez cəzalandırmasından daha ağırdır. Çünki tez gələn cəza insanın daha çox günah işləməsinə mane olur. ***"Rəbbinin ayələri ilə öyüd-nəsihət verildikdən sonra onlardan üz döndərən kəsdən daha zalım kim ola bilər?! Biz, şübhəsiz ki, onlardan intiqam alacağıq!".*** *(əs-Səcdə 22).* ***«Şübhəsiz ki, biz intiqam alacağıq*** *(MUNTƏQİM)****».*** *(əd-Duxan 16).* Aişə O rəvayət edir ki, Peyğəmbər 3 öz nəfsi üçün intiqam almamışdır. Ancaq Allahın haqları tapdanıldığı zaman Allah üçün intiqam alardı»[256]. ***Muntəqim* –** ismi-fail olan ***Naqamə*** feli dörd mənada işlədilir. Bunlardan: Azmaq, həddi aşmaq, yaxalamaq, qınamaq, cəzalandırmaq. ***«Bizi qəzəbləndirdikdə onlardan intiqam alıb hamısını*** *(suda)* ***qərq etdik».*** *(əz-Zuxruf 55).* ***«Sənin bizdən intiqam almağın isə ancaq Rəbbimizin möcüzələri gələn kimi bizim iman gətirməməyimizə görədir».*** *(əl-Əraf 126).* Bu ayədə intiqam qınamaq və pisləmək mənasındadır. Allah intiqam haqqı olan və intiqam sahibidir. Onun intiqamı qulun əmr və qadağalara uymaması, Ona və Peyğəmbərinə itaət etməməsinə görədir. İntiqamı haqq edən heç bir qul Ondan qaça bilməz. İntiqam almaq üçün də başqalarının yardımına ehtiyacı yoxdur.

Mömin qul Allahın intiqamından qorxmalı və Ona üsyan etməkdən qaçınmalıdır. İxtiyar sahibi olanlar Allahın sərhədlərini aşdıqlarına görə İslamda olan cəzalara uyğun onlardan (həddi aşanlardan) Allah üçün intiqam almalıdır. Hər müsəlman Allahdan başqa həqiqi intiqam sahibi olmadığını bilməlidir.

***Kim Zikr Edib:*** Xattabi, Beyhəqi, İbn Vəzir, Qurtubi, İbn Həcər, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUNƏBBİ

***əl-Munəbbi* – "***(Peyğəmbər)* ***əhvalatı*** *(Həfsəyə)* ***bildirdikdə o: "Bunu sənə kim xəbər verdi?" – deyə soruşmuş, o da: "Bunu mənə*** *(hər şeyi)* ***bilən,*** *(hər şeydən)* ***agah olan*** *(Allah)* ***xəbər verdi!" – deyə cavab vermişdi".*** *(ət-Təhrim 3).*

[255] "Məcmuul Fətava" 8/96.
[256] Buxari 3/331, Müslim 2327.

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUNCİ

***əl-Munci – "Musa və onunla birlikdə olanların hamısını xilas etdik".*** *(əş-Şuəra 65).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUNZİL

***əl-Munzil – "Həmçinin*** *(gəmidən enəndə)* ***belə de: "Ey Rəbbim! Məni mübarək*** *(xeyir-bərəkətli)* ***bir yerə endir. Sən sığınacaq verənlərin ən yaxşısısan!".*** *(əl-Muminun 29).*

***Kim Zikr Edib:*** İbn Vəzir, Qurtubi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## MUNZİR

***əl-Munzir – "Həqiqətən, Biz sizi yaxın bir əzabla*** *(Qiyamət gününün əzabı ilə)* ***qorxutduq. O gün insan öz əlləri ilə etdiyi*** *(yaxşı, pis)* ***əməlləri görəcək, kafir isə: "Kaş*** *(bu əzabı görməmək üçün)* ***torpaq olaydım!" – deyəcəkdir".*** *(ən-Nəbə 40).*

***Kim Zikr Edib:*** İbn Vəzir, Qurtubi, İbn Arabi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

## MUNŞİ

***əl-Munşi – "****(Ya Rəsulum!)* ***De: "Yer üzünü gəzib*** *(Allahın)* ***məxluqatı*** *(ilk əvvəldən)* ***nə cür yaratdığına baxın. Sonra da Allah axirət həyatını yaradacaqdır.*** *(Birinci yaradılışdan sonra ikinci yaradılış gələcəkdir)****. Allah hər şeyə qadirdir!".*** *(əl-Ənkəbut 20).*

***Kim Zikr Edib:*** İbn Vəzir – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

## MUNİM

***əl-Munim – "****(Süleyman qarışqanın)* ***bu sözündən gülümsəyib dedi: "Ey Rəbbim! Mənə mənim özümə və ata-anama ehsan buyurduğun nemətə şükür etmək, Sənin razı qalacağın yaxşı iş görmək üçün ilham*** *(qüvvət)* ***ver! Və məni öz mərhəmətinə saleh bəndələrinin zümrəsinə daxil et!".*** *(ən-Nəml 19).*

***Kim Zikr Edib:*** Cəfər Sadiq, İbn Məndə – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUNİR

***əl-Munir* – *"Göyləri və yeri*** *(yoxdan)* ***xəlq edən, zülmətləri və nuru yaradan Allaha həmd*** *(şükür və tərif)* ***olsun****! (Bu qüdrəti gördükdən)* ***sonra kafir olanlar yenə*** *(bütləri)* ***öz Rəbbinə tay tuturlar".*** *(əl-Ənam 1).*

***Kim Zikr Edib:*** Əsbəhani – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUHLİK

***əl-Muhlik* – "***(Ya Rəsulum!)* ***Sənin Rəbbin mərkəzlərinə*** *(ən böyük şəhərlərinə)* ***ayələrimizi oxuyan bir Peyğəmbər göndərməmiş məmləkətləri məhv etmədi. Biz yalnız əhalisi zalım olan məmləkətləri yox etdik!".*** *(əl-Qəsəs 59).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUHİN

***əl-Muhin* – "***(Ey insan!)* ***Məgər göylərdə və yerdə olanların*** *(bütün canlıların),* ***Günəşin, Ayın və ulduzların, dağların, ağacların və heyvanların, insanların bir çoxunun*** *(möminlərin)* ***Allaha səcdə etdiyini görmürsənmi? Bir çoxuna da*** *(kafirlərə də)* ***əzab vacib olmuşdur. Allahın alçaltdığı kimsəni heç kəs yüksəldə*** *(səadətə qovuşdura)* ***bilməz. Həqiqətən, Allah dilədiyini edər!".*** *(əl-Həcc 18).*

# MUCİD

***əl-Mucid* –** Dəlil tapa bilmədim. *Doğrusunu Allah Bilir!*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUHİ

***əl-Muhi* – "***(Ya Rəsulum!)* ***Biz Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy göndərdiyimiz kimi, sənə də vəhy göndərdik".*** *(ən-Nisa 163).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUZI'

***əl-Muzı'* - "***(Süleyman qarışqanın)* ***bu sözündən gülümsəyib dedi: "Ey Rəbbim! Mənə mənim özümə və ata-anama ehsan buyurduğun nemətə şükür etmək, Sənin razı qalacağın yaxşı iş görmək üçün ilham*** *(qüvvət)* ***ver! Və məni öz mərhəmətinə saleh bəndələrinin zümrəsinə daxil et!".*** *(ən-Nəml 19).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUSI'

***əl-Musı' - "Biz göyü qüdrətimizlə*** *(qüdrət əlimizlə)* ***yaratdıq və Biz*** *(istədiyimiz hər şeyi yaratmağa)* **qadirik.** *(Və ya: Biz göyü qüdrətimizlə yaratdıq və Biz onu genişləndirməkdəyik)". (əz-Zaruyat 47).*

***Kim Zikr Edib:*** İbn Məndə, İbn Arabi, İbn Vəzir – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# MUSI

***əl-Musı - "Allah övladlarınız haqqında sizə tövsiyə buyurur ki, oğula iki qız hissəsi qədər pay düşür...".*** *(ən-Nisa 11).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MOVİL

***əl-Movil - "Rəbbin bağışlayandır, mərhəmətlidir. Əgər*** *(Rəbbin)* ***onları günahlarına görə cəzalandırmaq istəsəydi, onların əzabını sürətləndirərdi. Lakin onların*** *(öz əzab)* ***vaxtı vardır*** *(O zaman)* ***onlar*** *(Allahın əzabından qaçıb canlarını qurtarmağa)* ***əsla bir yer tapa bilməzlər!".*** *(əl-Kəhf 58).*

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# MUYƏSSİRU

***əl-Muyəssiru – "Varlı-karlı olan öz varına görə*** *(süd haqqı)* ***versin. İmkanı az olan isə Allahın ona verdiyindən versin. Allah heç kəsi Özünün ona verdiyindən artıq xərcləməyə məcbur etməz. Allah hər bir çətinlikdən sonra asanlıq*** *(yoxsulluqdan sonra dövlət)* ***əta edər".*** *(ət-Talaq 7).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# NĀSİR

***ən-Nāsir – "****(Ya Rəsulum!)* ***Söylə: "Sizə bunlardan*** *(dünya zinətlərindən)* ***daha yaxşısını xəbər verimmi? Allahdan qorxub pis əməllərdən çəkinənlər üçün Rəbbi yanında*** *(ağacları)* ***altından çaylar axan cənnətlər*** *(bağlar)* ***vardır ki, orada əbədi qalacaqlar. Onlardan ötrü orada*** *(hər cür eyibdən)* ***pak olan zövcələr və*** *(ən böyük nemət olan)* ***Allah rizası*** *(razılığı, hüsn-rəğbəti)* ***vardır. Allah, həqiqətən, bəndələrini görəndir!".*** *(Ali İmran 15).*

***Kim Zikr Edib:*** Beyhəqi, Qurtubi, Həmud, İbn Vəzir, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# NĀZİR

***ən-Nāzir –*** İsim deyil, Xəbər formasında gəlib. Əbu Zərr K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Üç kimsə vardır ki, Qiyamət günü Allah onlarla danışmaz, onlara nəzər salmaz (baxmaz), onları təmizə çıxarmaz və onlar üçün şiddətli bir əzab vardır...»[257].

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# NĀSİX

***ən-Nāsix – "Biz*** *(zaman, məkan və şəraitin tələbinə görə)* ***hər hansı bir ayəni*** *(ayənin hökmünü)* ***ləğv edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud ona bənzərini gətiririk. Allahın hər şeyə qadir olmasını bilmirsənmi?!".*** *(əl-Bəqərə 106).*

***Kim Zikr Edib:*** Şərbasi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# NƏXİR

***ən-Nəxir*** - İsim deyil, Xəbər formasında gəlib.

***Kim Zikr Edib:*** İbn Məndə – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# HUVƏ

***əl-Huvə*** - Rabia İbn Kəb əl-Əsləm K rəvayət edir ki, Rəsulullah 3 evində gecələdim. Gecə namazına qalxdıqda buyurdu: "***Subhənə Rabbil Aləminə Huvə, Subhənəllah Vəlhəmdulilləh Huvə***"[258]. Qurtubi deyir ki: "Huvə - Allahın Sifəti deyildir. Huvə - gecənin vəsfidir".

***Kim Zikr Edib:*** Qurtubi – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# VACİD

***əl-Vacid –*** İsim deyil, Xəbər formasında gəlib. ***"Sənin şaşqın*** *(yaxud: uşaq vaxtı Məkkə vadisində azmış)* ***vəziyyətdə tapıb yol göstərmədimi?!".*** *(əd-Duhə 8).*

***Kim Zikr Edib:*** Xattabi, Həlimi, Beyhəqi, Əsbəhani, İbn Qeyyim, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

---

[257] Buxari 2358, Müslim 106, Əbu Davud.

[258] Nəsəi 1600, Tirmizi 3416, əl-Albani "Səhih Əbu Davud" 1193, "Səhih İbn Məcə" 3129.

# VĀLİ

***əl-Vali*** **-** İsim deyil, Xəbər formasında gəlib.

***Kim Zikr Edib:*** Xattabi, Əsbəhani, Qurtubi, İbn Qeyyim, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# VƏQİ

***əl-Vəqi*** **–** Qurani Kərimdə bu İsim Həfiz (qoruyan) ismi mənasında, Xəbər formasında işlədilmişdir. ***«Onları pisliklərdən qoru. O, gün pisliklərdən kimi qorusan, şübhəsiz ki, ona rəhm etmiş olursan. Ən böyük uğur və qurtuluş budur».*** *(əl-Mumin 9).* ***«Bizi Cəhənnəm əzabından qoru».*** *(əl-Bəqərə 201).* ***«Onları Allahın əzabından qoruyan*** *(VƏQİ)* ***olmaz».*** *(ər-Rəd 34).* Hər bir müsəlman qoruyucunun Allah olmasını bilməsi sonra da özü və başqaları üçün qoruyucu tədbirlərini görməlidir. ***«Ey iman gətirənlər! Özünüzü və yaxınlarınızı atəşdən qoruyun».*** *(ət-Təhrim 6).* Allah qorxusu təqva[259] olmadıqca qorunmaq da mümkün deyildir. Buna görə də böyük və kiçik bütün günahlardan çəkinmək və başqalarını da çəkindirməliyik. Beləcə həm özünü, həm də başqalarını qorumuş olur. Allahın qadağalarından birini edən və ya Allahın əmrlərindən birinə zidd davranan kimsə Allahdan qorunmamış deməkdir. Bu kimsə özü ilə Allahın əzabı arasına bir qalxan qoymamış, Allahı qoruyucu olaraq dəyərləndirməmiş və özünü təhlükələrə atmış deməkdir.

***Kim Zikr Edib:*** Qurtubi, Şərbasi – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# VĀFİ

***əl-Vāfi*** **–** İsim deyil, Xəbər formasında gəlib. ***"Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi xatırlayın,*** *(Tövratda axirüzzəman Peyğəmbər barəsindəki)* ***buyurduğumu yerinə yetirin ki, Mən də sizinlə*** *(sizi Cənnətə varid etmək barəsində)* ***olan əhdə vəfa edim. Yalnız Məndən qorxun!".*** *(əl-Bəqərə 40).*

---

[259] ***Təqva – Vuqayə*** – sözündən alınmışdır. Qalxan, qorunmaq deməkdir. Yəni Allahın əzabı ilə özün arasında bir maneə, qalxan tutmaqdır. Allahın əzabından qorunmaq isə Onun qadağalarından çəkinməklə, əmr etdiklərini yerinə yetirməklə mümkündür. ***«Ey iman gətirənlər! Allahdan haqq təqvası ilə qorxun».*** *(Ali İmran 102).* ***«O, halda Allahdan gücünüz çatdığı qədər qorxun».*** *(ət-Təğabun 16).* ***«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin».*** *(əl-Əhzab 70).* ***«Kim Allahdan qorxarsa Allah ona çıxış yolu verər və heç ummadığı yerdən də onu ruziləndirər».*** *(ət-Taləq 2,3).* ***«Ey iman gətirənlər! Əgər Allahdan qorxsanız O, sizə haqla-nahaqqı ayırd edən*** *(bir nur)* ***verər. Günahlarınızın üstünü örtüb sizi bağışlayar. Allah böyük lütf, mərhəmət sahibidir».*** *(əl-Ənfal 29).* Əbu Hureyrə K rəvayət edir ki, səhabələr: «Ya Rəsulullah! İnsanların ən şərəflisi kimdir?» deyə soruşdular. Peyğəmbər: «Təqvaca ən üstünlər…» deyə buyurdu. Buxari 3353, Müslim 2562.

***Kim Zikr Edib:*** Vəlid İbn Muslim – *Allah Ondan Razı Olsun* – bunu İsim olaraq zikr etmiş.

# VAFİ

***əl-Vafi – "O gün Allah onların cəzasını layiqincə verəcək və onlar Allahın*** *(Allahın onlara verdiyi vədin)* ***açıq-aşkar bir haqq olduğunu biləcəklər!".*** *(ən-Nur 25).*

***Kim Zikr Edib:*** İbn Məndə, Həlimi, Beyhəqi, Qurtubi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər.

# İLHAD

***İlhad*** **–** dildə «əyilmək» deməkdir. ***İstilahi Mənası*** **–** inanılması və ya edilməsi lazım olan şeydən başqa yana əyilmək deməkdir. İki növdür:

**1.** Allahın İsimlərində ilhad. Bu özü də dörd qismə bölünür.

1) Tətilçilərin etdikləri kimi İsimlərin hər hansı birini və ya bunların göstərdikləri sifətləri inkar etmək.

2) Təşbihçilərin etdikləri kimi Allahın İsimlərini və Sifətlərini məxluqatın isim və sifətləri kimi olduğunu qeyd etmək (bənzətmək).

3) Allahın İsimlərini bütlərə qoymaq. Məs: Allahın ***əl-İlah*** adını, ***əl-Lat*** adı ilə dəyişərək öz bütlərinə qoymuşlar. ***əl-Lat*** **–** Taif şəhərində ağ dağın adı idi. ***əl-Əziz*** adını, ***əl-Uzza*** **–** İbn Cərir Σ deyir: «Məkkə ilə Taif arasında, Nəxl adlanan yerdə ağac adı idi». ***əl-Mənnan*** adını, ***əl-Manat*** **–** Məkkə ilə Mədinə arasında, Hudeydə adlanan yerin adı idi.

4) Allahın özü-özünə vermədiyi bir qisim İsimlərlə Allahı adlandırmaq. Məs: Yəhudi və Xristianların dediyi kimi Ata, oğul və bizim dilimizdə işlənən o, kişiyə qurban olum və s. ***«Bir deyin görək Lat və Uzza nəyə qadirdir. Digəri üçüncüsü olan Manat da həmçinin… O, bütlər sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlara dair bir dəlil endirməmişdir».*** *(ən-Nəcm 19-23).*

**2.** Allahın ayələrində ilhad. Bu da iki qismdir:

1) Şəri ayələrdə ilhad - bu ayələri təhrif etmək, ayələrin bildirdiyi xəbərləri yalanlamaq ya da bu ayələrin hökümlərinə qarşı çıxmaq ilə olur.

2) Kovni ayələrdə ilhad – bu ayələri Allahdan başqasına nisbət etmək və ya bu ayələrdə bir ortağı (şəriki), köməkçisi olduğuna inanmaqdır.

İbn Qeyyim Σ deyir: «Allahın İsimlərində ilhad (əyriliyə, inkara sapmaq) o, İsimləri həqiqətləri və mənalarını onlar haqqında sabit olmuş haqq mənalarından uzaqlaşdırmaq deməkdir. Bu kəlmə meyl etmək, sapmaqdan alınmışdır. Həmçinin «***Ləhadə***» kökü də buna dəlalət etməkdədir. ***Ləhd*** **–** ortasından yana doğru qazılmış qəbrin yan tərəfində yarıq açmaq deməkdir. Haqdan meyl edən və haqq olmayan şeyləri dinə

salan kimsə haqqında da işlədilən Mulhid kəlməsi də buradan gəlməkdədir.

# İSTİVA

***İstiva*** **–** Allahın feli sifətlərindəndir. ***İstiva*** **–** üstə olmaq, yüksəlmək, çıxmaq deməkdir. Allahın yeddi səmanın üstündə yaratdıqlarından ayrı olaraq Ərşin üzərunə istiva etdiyinə və elmi ilə hər bir şeyi əhatə etdiyinə iman gətirilməlidir. Qatadə İbn ən-Numan K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: «Allah yaratmağı qurtardıqdan sonra ərşin üzərinə istiva etdi»[260].

Əbu Muhəmməd AbdulQadir əl-Ceylani[261]: «Hər cür əskikliktən və qüsurdan münəzzəh olan Allah, yüksəklik yönündə (yuxarı tərəfdə) Ərşinə İstiva edəndir, mülkü əhatə edəndir» sözlərini açıqlayaraq demişdir: «Allahın hər yerdə olduğunu qeyd etmək düzgün deyildir. Əksinə Allah göydə, Ərşə İstiva etmişdir deyilməsi daha mötəbərdir. Allah buyurur: ***«Rahmən ərşə istiva etdi»****. (Ta ha 5).* İstiva kəlməsini hər hansı bir təvilə yol vermədən olduğu kimi işlətmək lazımdır. Belə ki, bu İstiva Ərşə edilən Zatı İstivasıdır. Nə Mucəssimə, nə də Kərramiyyənin dediyi kimi Ərşin üzərinə oturmaq və onunla doğrudan-doğruya təmasda olmaq (yəni ona, ərşə doğrudan) dəymək mənasında deyildir. Nə də Mutəzilənin dediyi kimi (Ərşi) istilə (***İstəvlə*** **–** zəbt etmək, hökmü altına almaq) və ona qələbə çalmaq mənasındadır. Nə də Əşariyyənin dediyi sifətlərin yüksəkliyi və ucalığı manasındadır. Çünkü Quran və Sünnədə olan dəlillər İstiva sözüylə bunları qəsd etməmişlər». Əhli Sünnə Allahın ərşinin üstündə olduğu inancında birləşmişlər (icma etmişlər). Onlardan heç biri Allahın Ərşin üzərində olmadığını söyləməmişlər. Heç kimsənin onlardan bu mənada nə nass, nə də zahir olaraq bir söz nəql etməsi mümkün deyildir[262].

Bu kəlməni Müxaliflərin yozduqları kimi zəbt etdi, hökmü altına aldı, qüdrəti ilə və s. mənalar ilə dəyişməməliyik. ***İstiva*** **–** məlumdur, keyfiyyəti isə məchuldur. Ona iman gətirmək isə vacibdir. Əbu Nuaym Cəfər İbn Abdullah deyir ki, biz İmam Məlikin Σ yanında idik. Bir nəfər: «Ey Abdullahın atası! Allah Ərşə necə istiva etdi?» İmam Məlik Σ bu sualı eşidəndə bərk qəzəbləndi. Başını aşağı salaraq, əlindəki çubuqla yerə

---

[260] əz-Zəhəbi «əl-Uluvv» s. 52, əl-Albani «Muxtasarul Uluvv» s. 98.

[261] İmam, alim, zahid, arif, Şeyxul-İslam Əbu Muhəmməd Muhyiddin AbdulQadir İbn Əbu Saleh Abdullah İbn Cəngi Dust əl-Ceyli əl-Hənbəli. Bağdadın şeyxi h. 471-ci il Ceylan qəsəbəsində doğulmuşdur. H. 571-ci ildə vəfat etmişdir. Əsərləri: «əl-Gunyə», «Tuhfetul Muttaqin», «Səbilul Arifin». Bax: İbn Rəcəb «Zeylu Tabaqatil Hanabilə» 1/290,310, «ən-Nucmuz Zahirə» 5/85,86, «Şəzəratuz Zəhəb» 4/119,202.

[262] «əl-Gunyə» s. 56,57, İbn Teymiyyə «Məcmuul Fətava» 5/85,86, Zəhəbi «Uluvv» (müxtəsər s. 284), İbn Qeyyim «İctimaul Cuyusil İslamiyyə» s. 175.

sürtərək fikrə daldı. Sonra başını qaldırıb əlindəkini atdı və: «Necəliyi ağılla dərk olunmaz. İstiva Allah üçün məlumdur (yəni bilinməz deyildir). Buna iman vacib, bu haqda sual vermək bidətdir. Səni də bir bidətçi kimi görürəm və bu adamın qovulmasını əmr etdi»[263]. İbn Qeyyim Σ deyir ki: «Allaha verilən İsim və Sifətlər tamamən ***Tovqifidir*** – Allah və Rəsulunun bildirməsi ilə bilinə bilər»[264]. İmam İshaq İbn Rahaveyh Σ deyir ki: «Elm əhlinin inancına görə O, ərşə istiva etmişdir. Yeddinci yerin dibindəki hər şeyi də bilir»[265].

***«İstiva Bilinməz Deyildir»*** sözü: Yəni dildə mənası bilinməz deyildir. Çünki mənası yüksəklik, üstə olmaq, yüksəlmək, çıxmaq deməkdir.

***«Necəliyi Ağilla Dərk Olunmaz»*** sözü: Ağıllarımızla Allahın ərşinə istivasının necəliyini anlamağımız mümkün deyildir, deməkdir. Bunun yolu ancaq və ancaq nəqli dəlillər olan Quran və Sünnə (hədislərdir). Quran və Sünnədə Allahın ərşinə istivasının necəliyini bildirən hər hansı bir dəlil yoxdur. Buna görə də bu haqda bizdə dəlil olmadığı üçün bu mövzuda susub danışmamağımız daha məsləhətlidir. Sual ola bilər ki: «Allahın Sifətlərinin necəliyi varmıdır?». Cavab olaraq deyirik ki: «Allahın Sifətlərinin mənaları tərəfimizdən bilinməkdədir. Necəliyi isə bizim üçün bilinməzdir. Çünki Allah bizə, bu Sifətlərin mənalarını bildirmiş, necəliyini isə bildirməmişdir. Sələf mütləq olaraq necəliyi rədd etməmişdir. Əsla, çünki bu bir tətildir. Allahın Sifətlərinin necəliyi vardır. Fəqət bu necəlik bizim üçün bir bilinməzdir. Çünki bir şeyin necəliyi, yalnız o, şeyi görməklə, ya bənzərini görməklə və ya onun haqqında gələn doğru xəbərlərlə bilinə bilər. Bu yolların heç biri Allahın Sifətləri haqqında mövcut deyildir. Sifətlər haqqında söz, zat haqında sözün bir budağıdır. Biz Allahın zatının necəliyinə varmadan qəbul etdiyimiz kimi, Sifətlərini də eyni onun kimi necəliyinə varmadan qəbul etməliyik. Sələflər deyirlər ki, müxaliflərdən biri sənə: «Allahın sifətlərindən hər hansı birinin necə olduğunu soruşarsa» ona belə de: «Yaxşı, Allah zatıyla necədir?» Heç şübhəsiz ki, Allahın zatının necəliyinə varmayacaqdır. O, zaman ona de: «Onun zatının necəliyini demək mümkün olmadığı kimi, Onun Sifətlərinin necəliyini deməkdə mümkün deyildir. Çünki sifətlər zata tabedirlər.

---

[263] Əbu Nuaym «əl-Hilyətul Əvliya» 6/325,326, İbn Abdul Bər «ət-Təmhid» 7/151, İbn Həcər «Fəthul Bəri» 13/406,407, İbn Qudamə «İsbatu Sifətil Uluvv», Zəhəbi «Uluvv» s 141,142.

[264] Bədaiul Fəvaid 1/166.

[265] İmam Zəhəbi «Uluvv».

***«Buna İman Vacibdir»*** sözü: Allahın özünə yaraşır bir şəkildə Ərşinin üzərinə İstiva etdiyinə inanmaq vacibdir. Çünki Allah özünü belə tanıtmışdır.

***«Bu Haqda Sual Vermək Bidətdir»*** sözü: Bu isə İstivanın necəliyi haqqında sual vermənin bidət olduğu mənasına gəlməktədir. Çünki belə bir sualı Peyğəmbər 3 və səhabələrin zamanında verilməmişdir.

Allah, Qurani Kərimdə **7** yerdə: əl-Əraf **54**, Ta ha **5**, ər-Rad **2**, Yunus **3**, əs-Səcdə **4**, Furqan **59**, əl-Hədid **4**-də ***Alə*** – üzərinə ön qoşması ilə, ***«Rahmən ərşin üzərinə yüksəldi»***. *(Ta ha 5).* İki yerdə isə: əl-Bəqərə **29**, Fussilət **11**-də ***Ilə*** – tərəf ön qoşması ilə, ***«Sonra səmaya tərəf üz tutaraq».*** *(əl-Bəqərə 29)*-də İstiva etdiyini bəyan etmişdi.

Müxaliflər İstiva kəlməsini bir çox mənalar ilə dəyişmişlər. Bunlardan ən məşhuru ***İstiva*** – sözünə ***Lə*** – şəkilçisi artıraraq ***İstəvlə*** – zəbt etmək, hökmü altına almaq mənasıdır. Heç bir qrammatika alimləri bu sözlərin eyni məna ifadə etdiklərini qeyd etməmişlər. ***İstiva*** – felin səkkizinci fəslinə aiddir və kökü ***Sin-Vav-Yə*** – dən ibarətdir. ***Əlif-Tə*** artırılaraq əmələ gəlib. ***İstəvlə*** – felin onuncu fəslinə aiddir və kökü ***Vav-Ləm-Yə*** – dən ibarətdir. ***Əlif-Sin*** artırmaqla düzəlir.

Şairin: ***Qad İstəvə Bişrun Aləl Iraqi***
***Min Ğayri Səyfin Və Dəmin Mihraqi***
Bişr İraqı İstilə (zəbt etmdi, hökmü altına aldı),
Qılıncsız qan tökmədən.

Sözlərinə gəlincə bu beytin sənədi olmadığı kimi, onu kimin söylədiyi və ondan bu beyti kimin nəql etdiyi bilinməməkdədir. İbn Teymiyyə Σ deyir: «Bunun ərəb şeri olduğuna dair səhih bir nəql yoxdur. Dil (qramatika) imamlarından bir çoxu onu inkar etmiş və dildə bilinməyən uydurma bir beyt olduğunu söyləmişlər. Bilindiyi kimi Rəsulullah 3 bir hədis dəlil olaraq irəli sürülərsə şübhəsiz ki, onun səhih olması lazımdır. O, halda isnadı belə bilinməyən və dil imamlarının inkar etdiyi bir beytin nə hökmü ola bilər? Əbul Muzəffərin «***əl-İfsah***» adlı əsərində Xəlilə: «Dildə «***İstiva***» kəlməsinin «***İstəvlə***» mənasına gəldiyinə heç rast gəldinmi?» deyə soruşdular. O: «Bu həm ərəblərin bilmədiyi bir şeydir, həm də dillərində belə bir şey caiz (qəbul) deyildir. Xəlil dildə imamdır. O, halda İstivaya (dildə) bilinməyən bir məna yükləmək, batil bir məna yükləmək adlanır»[266].

Həmçinin bizə Qurani Kərimdən göründüyü kimi, sonra Ərşə yüksəldi. Müxaliflərin dediyi kimi olsa, sonra hökmü altına aldı – belə

---

[266] «Məcmul Fətava» 5/146.

çıxır ki, əvvəl Ərş Allahın hökmü altında deyildi, həmçinin hökmü altına almaq acizliyin əlamətidir. Allah əvvəl aciz olub, sonra güc toplayaraq öz hökmü altına alıb. İkinci tərəfdən əgər Allah, onların dediyi kimi Ərşi hökmü altına alıbsa bəs qalan məxluqlar necə? Biz bilirik ki, Allah göyləri və yeri yaratmamışdan əlli min il əvvəl də hər bir şey Allahın hökmü altında olub və olacaqdır. İstivanın həqiqətini inkar edən hər kəs Muattıl olur. Yenə istivanı yaradılmışların bir-birlərinə olan istivasına bənzədən kimsə də Müşəbbih olur. Hər kimdə Allahın İstivasının bənzəri heç bir şey yoxdur deyərsə o, Muvahiddir (Tövhid əhlidir), Munəzzihdir (Allahı əskiklik və qüsur sifətlərindən təmizliyəndir).

## ƏRŞ VƏ KURSİ

Əhli Sünnə Vəl Cəmaat - Ərş və Kursinin də haqq olduğuna inanırlar. ***Ərş*** **–** kəlməsi Qurani Kərimdə **21** yerdə qeyd olunur. ***«Şanlı ərşin sahibi də odur».*** *(əl-Buruc 15).* ***«Ərşin sahibi olan Allah».*** *(əl-Mumin 15).* ***«O, böyük ərşin sahibi olan Allahdan başqa ilah yoxdur».*** *(ən-Nəml 26).* ***«O, uca və kərim olan ərşin sahibidir».*** *(əl-Muminun 116).* ***Ərş*** *– Taxt deməkdir.* ***«Onun çox böyük əzəmətli ərşi*** *(taxtı)* ***də vardı».*** *(ən-Nəml 23).* ***«Yusif ata-anasını taxt*** *(öz taxtının)* ***üstünə qaldırdı».*** *(Yusif 100).*

Ərş mələklərin daşıdığı və tutacağı taxtdır. Ərşin tutacağı vardır. Rəsulullah 3 buyurur: «İnsanların çaşqın olan vaxtı ilk oyanan mən olacağam. Bir də baxıb görəcəm ki, Musa A Ərşin tutacağından tutub»[267]. Aləmin üzərində Qübbə formasındadır Rəsulullah 3 buyurdu: «…Yazıqlar olsun sənə! Sən Allahın (böyüklüyünün və ucalığının) nə olduğunu bilmirsən? Şübhəsiz ki, Onun Ərşi göylərin (Başqa rəvayətdə: Yerlərin) üstündədir. (Allahın Ərşi) belədir deyib: «(Peyğəmbər bu an) barmaqlarıyla işarə edərək: «Eynilə Qübbə kimidir» dedi[268], bütün məxluqatın tavanıdır. Rəsulullah 3 buyurdu: «Allahdan Cənnəti istədiyiniz zaman Firdovs Cənnətini istəyin. Çünkü o, Cənnətin ən yüksək yeri və Cənnətin ən orta yeridir. Onun üstündə Rahmənin Ərşi vardır»[269]. Rəsulullah 3 buyurur: "Allah məxluqatı xəlq etdikdən sonra Ərşi üzərində (Lövhi Məhfuzda) Rəhmətim Qəzəbimi üstələmişdir"[270].

***Ərş*** **–** kəlməsini mülk, qüdrət kimi təhrif (dəyişmək) etmək istəyənlər bu ayələrə nə deyirlər. ***«Həmin gün Rəbbinin ərşini onların*** *(başı)*

---

[267] Buxari, Müslim.
[268] Əbu Davud 4726, İbn Əbi Asim «əs-Sünnə» 575,576, İbn Xuzeymə «Tövhid» s. 103,104, Zəhəbi «Uluvv» s. 37,39 - Zəif hədis.
[269] Buxari.
[270] Tirmizi 2/271, Əhməd 2/433, İbn Məcə 4295, əl-Albani "Səhih Silsilə" 1629.

***üstündə səkkiz mələk daşıyacaqdır».*** *(əl-Həqqa 17).* ***«Onun ərşi suyun üzərindədir».*** *(Hud 7).* Əbu Rəzin əl-Ukayl K deyir ki: "Ey Allahın Rəsulu! Rəbbimiz bu məxluqatı yaratmamışdan əvvəl harada idi?". Rəsulullah 3 buyurdu: «O, tək başına heç bir şey olmadan O, vardı. Altı hava, üstü hava (boşluq) idi. Ərşi də su üzərində yaratdı»[271]. İbn Abbas K rəvayət edir ki, Rəsulullah 3 səhabələrə buyurdu: «Bilirsinizmi, səma ilə yer arasında nə qədər məsafə var?» Səhabələr: «Allah və Rəsulu daha gözəl bilir». Rəsulullah 3 buyurdu: «Onlar arasında məsafə **500**-ildir. Həmçinin hər bir səma ilə (o, biri səma qatı arası) **500**-ildir. Yeddinci səma ilə Ərşin arasında dəniz vardır (Başqa rəvayətdə: Yeddinci səma ilə kürsi arasında məsafə **500**-ildir. Kürsi ilə dəniz arasında da **500**-ildir. Ərş isə dənizin üzərində yerləşir. Allah isə Ərşin üzərindədir[272]). Bu dənizin dibi ilə səthi arası səma ilə yer arasında olan məsafə qədərdir. Allah bunların hamısından yuxarıdadır. Adəm övladlarının heç birinin əməli ondan gizli qalmaz»[273]. Mucahid Σ deyir ki: "Yeddinci səma ilə Ərş arasında **70000** min hicab var. Musa A yaxınlaşmağa davam edirdi. Hətta o, qədər yaxınlaşdı ki, Musa və Ərş arasında bir hicab qaldıqda o, öz yerini gördü və (Qədəri) yazan qələmin cırıltısını eşitdikdə buyurdu: "Ya Rəbbim! İzin ver Sənə baxım"[274]. Həsənul Bəsri Σ deyir ki: "Məxluqatdan İsrafil A qədər Allaha yaxın olan məxluq (mələk) yoxdur. Onunla Rəbbi arasında **70** hicab vardır və hər bir hicab (arasında) **500**-illik məsafə vardır. İsrafil A bütün bunlardan yüksəkdədir. Onun başı Ərşin altında, çiyinləri isə yeddi səmanın sonundadır"[275].

Rəhmanın Ərşinin ağırlığı, böyüklüyü haqqında Rəsulullah 3 buyurur: «Yaratdıqlarının sayı qədər, özünün razı olacağı qədər, Ərşinin ağırlığı qədər və kəlmələrinin sayı qədər Allaha həmd edərək o, pak və nöqsansızdır»[276]. Rəsulullah 3 sıxıntı anlarında buyurardı: «Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. O, çox böyükdür, Həlimdir. Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. O, böyük Ərşin Rəbbidir. Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. Göylərin Rəbbidir, yerin

---

271 Tirmizi «Tuhvətul Əhvəzi» 8/528, İbn Məcə «Muqəddimə Fi Mə Ənkərat Həsən əl-Cəhmiyyə», Əhməd «Musnəd» 4/11, əl-Albani əs-Sunnənin təhricində 216 zəif.

272 Bu hədisi İbn Mehdi Həmməd İbn Sələmədən o, da Asim İbn Bəxdəlidən o, da Zirra İbn Xubeyşdən o, da Abdullah İbn Məsuddan. Əl-Məsudi Asimadan o, da Əbu Vaidən o, da Abdullahdan.

273 Tirmizi 3317, Əbu Davud 4723-4724-4725, Əhməd 1/206-207, İbn Məcə 193, Beyhəqi "Əsmə" 401.

274 Beyhəqi "Əsmə" 508, Zəhəbi "Uluv", əl-Albani "Səhih".

275 İbn Qudamə" İsbat" 111, Zəhəbi "Uluv", Bəğavi "Təfsir".

276 Müslim.

Rəbbidir. Kərim olan Ərşin Rəbbidir»[277]. Cabir K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: «Allahın Ərşi Sad İbn Muazın K ölümü ilə titrədi»[278].

Kursi Ərşdən sonra gəlib, ondan ayrıdır. Kursi dildə – döşək və ya üzərində otrulan hər şey deməkdir. ***«And olsun ki, biz Süleymanı imtahana çəkdik. Taxtının üstünə bir cinn oturtduq*** *(və ya ruhsuz bir cəsəd atdıq).* ***Sonra o*** *(peşman olub tövbə etdi və yenidən öz mülkünə taxtına)* ***qayıtdı».*** *(Sad 34).* Allahın Kursisi isə onun iki ayağının qoyduğu yerdir. İbn Abbas K dedi: «Kursi iki ayağın qoyulduğu yerdir. Ərşin böyüklüyünü isə Allahdan başqa heç kəs bilməz»[279]. O, da Qurani Kərimdə yalnız bir yerdə qeyd olunur. ***«Onun kursisi göyləri və yeri əhatə etmişdi».*** *(əl-Bəqərə 255).* Kursinin elm olması haqda bəzi alimlər hədislər də gətirirlər. Lakin bu hədislərin hamsı zəifdir[280].

***Ərş –*** ilə Kursinin müqayisəsini Rəsulullah 3 belə izah edir. «Yeddi qat göy və yeddi qat yer, Allahın Kusisi yanında geniş səhraya atılmış bir halqa kimidir. Ərşin Kursiyə üstünlüyü isə bu geniş səhranın halqaya üstünlüyü kimidir»[281]. İbn Zeyd K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Yeddi qat göy və yeddi qat yer Kursi ilə müqayisədə qalxanın içərisinə atılmış yeddi dirhəmə oxşayır»[282]. İbn Abbas K dedi: «Yeddi səma və yeddi yer Rəhmanın əlinin içində (ovcunda) sizdən birinizin əlinin içində tutduğu xardal dənəsinə oxşar».

Sələflər deyirlər ki, müxaliflərdən biri sənə: «Allahın Ərşinə İstivasını, Ərşin üzərində, üstündə olmasıyla açıqlayırsınızsa deməli Allahı üstündə daşıyacaq bir taxta (Ərşə) möhtac olduğunu irəli sürmüş olursunuz». Buna cavab olaraq belə deyirik: «Allahın Ərşə də Kursiyə də ehtiyacı yoxdur. Allah Ərşə ehtiyacı olduğu üçün İstiva etməmişdir. Allah Ərşə də, başqa şeylərə də möhtac olmaqdan münəzzəhdir. Allahın böyüklüyünü, qüdrət, qüvvət və zənginliyinin mükəmməlliyini bilən hər kəs Allahı üstündə daşıyacaq bir taxta ehtiyacı olduğunu ağlının ucundan

---

[277] Buxari, Müslim.
[278] Buxari 3808.
[279] Abdullah İbn Əhməd «əs-Sünnə» 586, ibn Əbi Şeybə «Kitabul Ərş» 61, İbn Huzeyfə «ət-Tövhid» s. 107, Həkim «Müstədrək» 2/310, əl-Albani «Muhtasarul Uluvv s. 102 ***Mövquf –*** səhabə sözü olaraq səhihdir. ***Mərfu –*** Peyğəmbər sözü olaraq edilən rəvayət zəifdir. Bax: «Zəif Hədislər Silsiləsi» 906, «Şərhul Əqidətul Təhaviyyə» tədqiqi s. 279, 299.
[280] «Fəthu Rabbil Bəriyyə bi Təlhisil Həməviyyə» Ərş və Kursi bölümü. Useyminin Σ şərhi ilə.
[281] İmam Əhməd 5/178,179, Nəsai «əs-Sunənul Kubra» bax: «Tuhfetul Əşraf» 9/180, İbn Hibban «əl-İhsan» 361, Beyhəqi «Əsmə və Sifət» 2/149 Əbu Zərrdən K. əl-Albani «Səhih Hədislər Silsiləsi» 109, «Muhtasarul Uluvv» s. 130.
[282] İbn Cərir ət-Təbəri.

belə keçirməz. Necə keçirsin ki? Allahın izzəti və uluhiyyəti Ərş və Kursidən də çox ucadır. Ərş də, Kursi də və digər yaradılmışlar da Allaha möhtacdırlar və Onun qüdrəti və hökmü ilə daşınmaqdadır. ***«Əlbəttə, Allah aləmlərə möhtac deyildir».*** *(Ali İmran 97).* ***«Ey insanlar! Siz Allaha möhtacsınız. Allah isə*** *(heç nəyə)* ***möhtac deyildir».*** *(Fatir 10).* Bütün bu yaradılmışlar O, olmadan nə var ola bilirlər, nə də ayaqda dura bilirlər. Necə ki, göyün və yerin Onun əmri ilə ayaqda durması Onun (varlığının və qüdrətinin) əlamətlərindəndir. ***«Göyün və yerin Onun əmrində durması… Onun qüdrət əlamətlərindəndir».*** *(ər-Rum 25).* Sələflər deyirlər: «Biz Allahın ehtiyac olmadan Ərş üzərinə İstiva və istiqrar etdiyini iqrar edirik. O, ehtiyac olmadan Ərşi də başqalarını da mühafizə edər»[283].

## ALLAHIN Ψ ULUV – UCALIQ SİFƏTİ VƏ SƏMADA OLMASI

Ərşin üzərində olmasına baxmayaraq, bütün yaratdıqları üzərində uca, onlardan ayrı olmasına baxmayaraq, onları görən, onların nə halda olduqlarını bilən, hər şeyi elmi ilə əhatə edən də odur. Heç bir şey ondan gizli qalmaz, kimsə onunla çəkişməz, ona qarşı çıxmaz, ona heç bir şeydə əngəl olmaz. Əksinə hər şey onun əzəməti önündə boyun əyər, izzəti qarşısında zəlildir. Hər şey onun hökmü, idarəsi altındadır. O, şanı etibarı ilə ən yüksəkdir. O, bütün kamil sifətlərin sahibidir, bütün əskikliklər ondan uzaqdır. ***Əzizdir***, ***Cəlildir***, şanı mübarək və çox ucadır.

***Uluv*** – Ucalıq deməkdir. Allahın zatı sifətlərindən olub iki qismə ayrılır:

**1.** ***Sifətlərin Uluvvu*** **–** Bu var olan hər kamil sifətin hər baxımdan ən ucasının və ən mükəmməlinin sadəcə Allaha aid olması deməkdir. İstər bu sifət ***Məcd*** (şərəf) və ***Kahr*** (kahr etmə) sifətlərindən, istərsə ***Cəmal*** (gözəllik) və ***Qadr*** (şan, şərəf, hörmət) sifətlərindən olsun heç fərq etməz.

**2.** ***Zatın Uluvvu*** **–** Bu isə Uca Allahın zatıyla bütün yaratdıqlarının üstündə olması deməkdir. Sələflər deyirlər ki: «Hər kim Allahın (zatıyla) göydə olduğunu inkar edərsə heç şübhəsiz ki, kafir olmuşdur»[284].

Allahdan bir şey istədikdə yuxarıdan istənilir, aşağıdan deyil. Çünki aşağı heç bir şeydə Rububiyyət və Uluhiyyət sifətlərindən deyildir. Həmçinin yüksəklik alçaqlığın ziddidir. Alçaqlıq da əskiklik sifətindəndir. Zatıyla yüksəkdə olan Allah isə bütün əskik sifətlərdən münəzzəhdir. Allahın zatıyla yüksəkdə, yuxarıda olduğunu göstərən üç İsmi vardır.

---

[283] «Əqidətul Vasitiyyə» s. 73.
[284] Zəhəbi «Müxtəsər əl-Uluvv» s. 137.

Bunlar ***əl-Aliyy***[285], ***əl-Ələ***[286] və ***əl-Mutəalidir***[287]. Bunların üçü də Qurani Kərimdə zikr edilmişdir. Allah daima uca və böyükdür. Allahın uca və böyük olmasını isə: **1.** Qurani Kərim. **2.** Sünnə. **3.** Səhabələrin icması. **4.** Ağıl. **5.** Fitrət sübut edir.

Allahın səmada olmasına Quran və Sünnədə **18**-cür isbat vardır:

**1.** ***Min*** – dan, dən, ön qoşması ilə Allahın yüksəkdə olması - Fövq. ***«Onlar, onların fövqündə olan Rəblərindən qorxarlar».*** *(ən-Nəhl 50).*

**2.** ***Min*** – dan, dən, ön qoşması gəlmədən. ***«O, öz qulları üzərində hakim-mütləqdir».*** *(əl-Ənam 18 və 61).*

**3.** Ona doğru yüksəliş. ***«Mələklər və ruh onun dərgahına müddəti əlli min olan bir gündə qalxarlar».*** *(əl-Məaric 4).* Rəsulullah 3 buyurur: «Onların arasında gecələyən mələklər yuxarıya qalxarlar (uruc edərlər). Allah onlardan soruşar….»[288].

**4.** ***Saədə*** – ***Suud*** – qalxmaq sözündən. ***«Pak söz ona tərəf yüksələr».*** *(Fatir 10).* Əbu Hureyrə K rəvayət edir ki, Peyğəmbər 3 buyurur: «Allaha ancaq gözəl bir şey yüksələr…»[289]. Əbu Musa əl-Əşari K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Allah yatmır. Ona yatmaq yaraşmaz. Mizanı (Başqa rəvayətdə: Ədaləti) endirsin və ya qaldırsın. Gündüzün əməlindən əvvəl gecənin əməli, gecənin əməlindən əvvəl gündüzün əməli ona (Allaha) yüksəlir (qaldırılır) Onun örtüyü (pərdəsi, hicabı) nurdur. (Əbu Bəkrin K rəvayətində pərdəsi atəşdir). Əgər üzündəki pərdəni qaldırsa üzünün nurları yaratdığı hər bir şeyi yandırar»[290].

**5.** ***Rafaə*** – ***Yarfəu*** – qalxmaq sözündən. Bir çox məxluqatı özünə doğru yüksəldən. ***«Ya İsa! Həqiqətən mən sənin ömrünü tamam edib öz dərgahıma qaldıraram».*** *(Ali İmran 55).* ***«Xeyir! Allah onu öz dərgahına qaldırmışdı».*** *(ən-Nisa 158).*

**6.** Mütləq ***Uluv*** (ucalıq) həm zatı, həm də sifətləri ilə. ***«O, Alidir*** *(ucadır)* ***və Azimdir*** *(böyük)».* *(əl-Bəqərə 255).* ***«Allah hər şeydən uca və böyükdür».*** *(əl-Həcc 62).*

**7.** Kitabın onun tərəfindən endirilməsi. Nazil olması. ***«O, yeri və uca göyləri yaradan Allah tərəfindən endirilmişdi».*** *(Ta ha 4).* ***«De ki, onu Ruhul-Qüds*** *(Cəbrail)* ***Rəbbindən haqq olaraq endirmişdi».*** *(ən-Nəhl 102).* ***«Həqiqətən biz Quranı dünya səmasına nazil etdik».*** *(Qədir 1).*

---

[285] Bax: əl-Bəqərə 255, ən-Nisa 34, əl-Həcc 62, Loğman 30, Səba 23, əl-Mumin 12, əş-Şura 51.
[286] Bax: ən-Nəziət 24, əl-Ələ 1, əl-Leyl 20.
[287] Bax: ər-Rəd 9.
[288] Buxari, Müslim.
[289] İmam Əhməd 3/33,418, əl-Albani «Muxtasarul Uluvv» s. 86, «İrvəlul Ğəlil» 886.
[290] Müslim 179/293, İmam Əhməd 4/395,401, İbn Məcə 195, Darimi «ər-Rədd aləl Mərisi» s. 173, Beyhəqi «Əsmə və Sifət» s. 402, əl-Albani «Muhtasarul Uluvv» s. 86, «Səhih Cəmius Səğir» 1860.

**8.** Bəzi məxluqların ona yaxın olması. ***«Rəbbinin yanında olanlar».*** *(əl-Əraf 206).* ***«Göylərdə və yerdə nə varsa onundur. Onun yanında olanlar isə…»*** *(əl-Ənbiya 19).* Rəsulullah 3 buyurur: «O, kitab onun yanında Ərşin üstündədir»[291]. ***«Fironun yoldaşı*** *(Asya dua edərək)* ***Ey Rəbbim! Öz dərgahında mənim üçün ev qərar et və məni Firon və onun əməlindən qurtar. Məni zalım qövmdən xilas et».*** *(Təhrim 11).*

**9.** ***Fi*** – da, də, ön qoşması ilə Allahın göydə olması. ***«Göydə olanın yeri titrədib sizi onun dibinə göndərməyəcəyinə əminsinizmi. Göydə olanın sizin üstünüzə daş yağdıran bir yel göndərməyəcəyinə arxayınsınızmı?»*** *(Mulk 16,17).* İbn Ömər K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Rəhman olan Allah Rəhm edənlərə Rəhm edər. Yerdə olanlara rəhm edin ki, səmada olan da sizə rəhm etsin»[292]. Rəsulullah 3 buyurdu: «Siz mənə iman gətirmirsiniz (Etibar etmirsiniz). Mən səmada olanın əminiyəm (Səmada olan mənə etibar etdiyi halda). Səhər-axşam mənə səmalardan xəbərlər gəlir»[293].

Allahın göydə olması bu iki mənadan birini kəsb edir.

1) Burada göy ilə yüksəklik qəsd edilmişdir. Buna görə də məna: «Allah yüksəkdədir, yəni yüksəklik yönündədir». Göy, Qurani Kərimdə sabit olan yüksəklik mənasındadır. Məs: ***«Göydən üstünüzə yağış yağdırmışdır».*** *(əl-Ənfal 11)*[294]. Yəni göyün özündən deyil, yüksəkdən su (yağış) endirir. Çünki yağış buluddan enər (yağar).

2) Ayədə keçən «***Fi – Səməi***» ləfsindəki ***«Fi» «Alə»*** mənasındadır ki, bundan da «Allah göyün üstündədir» olur. Qurani Kərimdə bir çox yerlərdə ***«Fi»*** (da, də içində), ***«Alə»*** (üstə, üzərində) mənasına gəlməkdədir. Məs: ***«Yer üzündə dolaşın».*** *(ət-Tövbə 2).* Yəni yerin üzərində dolaşın, içində deyil. *(Firon dedi)* ***Mən də sizin əl-ayağınızı çarpaz kəsdirib xurma ağaclarının kötüklərindən asacağam».*** *(Ta ha 71).* Yəni xurma ağacının üzərinə asacağam, içinə deyil.

**10.** ***İstiva*** – ucalması. ***«Rahmən ərşin üzərinə yüksəldi».*** *(Ta ha 5).* ***«O, böyük əzəmətli Ərşin sahibi».*** *(əl-Muminun 86).*

**11.** Dua edərkən əllərin qaldırılması. Salman Farisi K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Əbədi və Kərim olan Rəbbimiz əllərini ona tərəf qaldıran qulunun əllərini geri boş qaytarmaqdan utanır»[295]. Əbu Hənifə Σ deyir ki: «Uca Allaha əllər yuxarıya qaldırılaraq dua edilir. Aşağıdan dua

---

[291] Buxari, Müslim.
[292] Buxari, Müslim.
[293] Buxari 4351, Müslim, Huzeymə 2373.
[294] Bax: əl-Bəqərə 22, İbrahim 32, ər-Rəd 17, əl-Hicr 22, Ta ha 53, əl-Həcc 5, 63.
[295] Əbu Davud 1488, Tirmizi 3551, İbn Məcə 3865. Musnəd 5/438.

edilməz. Aşağıda olmanın Rububiyyətdən və Uluhiyyətdən heç bir əlaqəsi yoxdur»[296].

**12.** Allahın dünya səmasına enməsi. Əbu Hureyrə K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «Rəbbimiz hər gecənin **1/3-**də dünya səmasına enir və buyurur: Mənə dua edənin duasını qəbul edərəm, məndən istəyənin istədiyini verərəm, bağışlanma diləyəni bağışlayaram»[297].

**13.** Rəsulullahın 3 vida həcci. Cabir İbn Abdullah K rəvayət edir ki, Rəsululah 3 vida həcci zamanı xütbəsində buyurdu: «Mən sizə dində olan hər bir şeyi çatdırdımmı?» Səhabələr: «Bəli, ya Rəsulullah!» Allah Rəsulu şəhadət barmağını qaldıraraq: «Ya Rəbbim! Sən şahid ol ki, mən onlara hər bir şeyi çatdırdım»[298].

**14**. ***Əynə*** – harada? Sözünün işlədilməsi. Müaviyə İbn əl-Həkəm əs-Sələmi K rəvayət edir ki, bir cariyəm var idi. Çöldə qoyun otarırdı. Bir gün canavar qoyunlardan birini yediyinə görə çox qəzəbləndim. Hətta cariyəyə sillə də vurdum. Peşmançılıq çəkdim və hadisəni Rəsulullaha 3 danışdım. Allah Rəsulu buyurdu: «Cariyəni yanıma çağır». Cariyə gəldikdə, Rəsulullah 3 buyurdu: «Sən möminəsən?» O, da bəli dedikdə Rəsulullah 3 buyurdu: «***Əynəallah*** – Allah haradadır?»[299].

**15.** Allahın səmada olmasını söyləyənin iman sahibi olması. Muaviyə İbn əl-Həkəm əs-Sələmi K rəvayət edir ki, Rəsulullah 3 cariyədən soruşdu: «***Əynəallah*** – Allah haradadır?» Səma üzərində. Bəs mən kiməm? «Sən Allahın Rəsulu»[300]. Bəlkə də bizlərin Allah haradadır deyə sual verməyimizə gülə bilərlər. Lakin yaradılmışların ən mükəmməli, Rəbbimizi ən gözəl tanıyan Allah haqqında haradadır deyə sual verdiyini unutmuşlar? O, da cariyənin gözəl cavabını qəbul etmişdir.

**16.** Fironun Allahın səmada olmasını yalanlaması. ***Firon dedi: «Ey Haman! Mənim üçün bir qəsr tik ki, bəlkə göylərin yollarına yetişim və Musanın Rəbbini görüm. Doğrusu mən onu yalançı sayıram».*** *(əl-Mumin 36-37).* Yəni Firon, Musanın A İlahının səmada olmasına dair vermiş olduğu xəbərin yalan olduğunu sayırdı. Buna görə də Firon öz qövmünə bunu sübut etmək üçün Hamana onun üçün Qəsr tikməsini əmr edir və sonra: ***«Doğrusu mən onu yalançı sayıram».*** *(əl-Mumin 36-37).* O, halda belə bir sual ortaya çıxır: «Nisbət etibarı ilə kim Firona daha

---

[296] Fikhul Əbsat s. 51.
[297] Buxari 1145, Müslim 168.
[298] Müslim, Əbu Davud 1905, İbn Məcə 3074, İmam Əhməd 3/313,371, əl-Albani «Muhtasarul Uluvv» s.83, «İrvalul Ğəlil» 4/201,209, «Mişkətul Məsabih» təhqiqi 2/783,787.
[299] Müslim 537, «əl-Fiqhul Əbsat» s. 47,48.
[300] Müslim 537.

yaxın olur? Allahın səmada olmasını qəbul edən bizlər? Yoxsa???» Heç şübhəsiz ki, Firon, Musanın A İlahının səmada olmasını yalan saymışdı. Allahın ucalığını və səmada olmasını qəbul etməyənlər Firon, səmada olmasını qəbul edənlər isə Musa və Muhəmmədin 3 yolundadırlar.

**17.** Rəsulullahın 3 merac səfəri. Onun orada Peyğəmbərlərlə görüşməsi, Allahın dərgahında namazın fərz olması və s[301]. Zeynəb O möminlərin anası, Rəsulullahın 3 zövcəsi – o biri qadınların yanında daima fəxr ilə deyərdi: «Sizi atalarınız ərə verib, məni isə Allah yeddi qat səma üzərində evləndirib»[302].

**18.** Qiyamət günü Cənnət əhlinin öz Rəblərini görmələri. ***«O, gün neçə-neçə üz öz Rəbbinin camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamət 22-23).*

Mən deyirəm ki, Allah Qurani Kərimdə bir çox ayələrin sonlarında buyurur ki, bu ayələrdə ağıl sahibləri, hikmətli insanlar üçün ibrətlər vardır. Ağlı olmayan insan yalnız bu qədər dəlilləri inkar edib Allahın göydə olmasını qəbul etməyə bilər. Səhabələrin, Tabiinlərin, Sələfi Salihin alimlərinin və bütün haqq yolda olan müsəlmanların da qəbul etdiyi, Allahın səmada olmasıdır. Əbu Muti deyir ki, Əbu Hənifədən Σ: “Mən Rəbbimin səmada, yoxsa yerdə olduğunu bilmirəm deyən kimsə barəsində soruşdum”. O, dedi: «Bu kimsə kafir olur». Çünkü Allah buyurur: ***«Rahmən ərşin üstünə yüksəldi».*** *(Ta ha 5).* Onun Ərşi isə yeddi səmanın üstündədir. Mən: «Əgər o, Ərşin üzərindədir dediyi halda, bilmirəm Ərş səmadadır, yoxsa yerdədir” desə? O, dedi: «Yenə o, kafirdir. O, Allahın səmada olmağını inkar edir»[303].

Ağıl və Fitrət ilə isbata gəlincə, bütün insanlar təbiətləri və səlim qəlbləri ilə dua etdikləri zaman əllərini yuxarı qaldırırlar. Uca Allaha yalvarıb-yaxardıqda da qəlbləri ilə yuxarını qəsd edərlər. Bu Allahın onları yaratmamışdan əvvəl qəlblərində fitrət olaraq yerləşdirdiyi hislərdir. Onlar bunu bir insandan, müəllimdən öyrənməmişlər. Bu sadəcə qəlbdə olan Allahın ucalığını göstərən hislərdir.

---

[301] Buxari, Müslim.

[302] Buxari 6984, Beyhəqi “Əsməu Və Sifət” səh:315,316, №880, Suyuti “Durul Mənsur” 6/611,612, “Xasaisul Kubra” 2/368, İbn Qudamə “İsbat Uluv” səh 109, İbn Kəsir “Təfsirul Quran” 6/407, “Səhih Sünən Tirmizi” 3213.

[303] Əbu İsmail əl-Ənsari əl-Faruk əsəri “Fikhul Əbsat” səh: 46, İbn Teymiyyə “Məcmuul Fətava” 5/48, Zəhəbi “Uluv” səh: 101,102, İbn Qudamə “Uluv” səh: 116.

# ALLAH Ψ BARƏSİNDƏ: "ƏYNƏALLAH – ALLAH HARADADIR?" DEYƏ SORUŞMAQ OLARMI?

***Əynə*** – harada? Sözünün işlədmək olarmı? Müaviyə İbn əl-Həkəm əs-Sələmi K rəvayət edir ki, bir cariyəm var idi. Çöldə qoyun otarırdı. Bir gün canavar qoyunlardan birini yediyinə görə çox qəzəbləndim. Hətta cariyəyə sillə də vurdum. Peşmançılıq çəkdim və hadisəni Rəsulullaha 3 danışdım. Allah Rəsulu buyurdu: «Cariyəni yanıma çağır». Cariyə gəldikdə, Rəsulullah 3 buyurdu: «Sən möminəsən?» O, da bəli dedikdə, Rəsulullah 3 buyurdu: «***Əynəallah*** – Allah haradadır?» deyə buyurdu. Cariyə: "Səma üzərində". Peyğəmbər: "Bəs mən kiməm?". Cariyə: «Sən Allahın Rəsulu». Peyğəmbər: "Onu azad et! Çünki o, möminədir" deyə buyrdu[304].[305] Rəsulullahın 3 bu barədə bu cür sual verməsi ən gözəl və ən açıq-aydın bir dəlildir ki, bu tərzdə sual vermək olar – Allah Haradadır? Bəlkə də bizlərin Allah haradadır? deyə sual verməyimizə gülə bilərlər. Lakin yaradılmışların ən mükəmməli, Rəbbimizi ən gözəl tanıyan Allah haqqında haradadır deyə sual verdiyini unutmuşlar?

Peyğəmbər 3 buyurdu: "Nəfsim əlində olan Allaha and olsun ki, kişi öz zövcəsini yatağa dəvət etdiyi zaman qadın imtina edərsə, əri (ondan) razı olana qədər Səmada olan ona qəzəb edər"[306]. Əbu Bəkr K Peyğəmbərin 3 yanına girir. Üzərindəki örtüyü qaldıraraq onu öpür və: «Atam, anam sənə fəda olsun! Sağlığında da səndən gözəl iy gəlirdi, öləndən sonra da səndən gözəl iy gəlir. Nəfsim əlində olan Allaha and olsun ki, Allah ölümü sənə iki dəfə daddırmaz. Əbu Bəkr K camaatın yanına çıxır. Allaha həmd səna etdikdən sonra: «Ey insanlar! Kim Muhəmmədə ibadət edirdisə bilsin ki, artıq o, vəfat etmişdir. Kim Allaha ibadət edirdisə bilsin ki, Allah Səmadadır, Allah əbədi və ölməzdir: ***«Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər!».*** *(əz-Zumər 30)*[307]. Məsruk K Aişədən O rəvayət edir ki: "Sıddıqın qızı sıddıqə, Allahın sevimlisinin sevimlisi olan (Aişə) mənə danışdı ki: "İfk hadisəsində bəraət yeddi səma üzərindən gəldi mənə"[308]. Peyğəmbər 3 buyurdu: "Uca və Böyük olan Allah hər gecə dünya səmasına enər və buyurar: Məndən

---

[304] Müslim 537.
[305] Müslim 537, «əl-Fiqhul Əbsat» s. 47,48.
[306] Buxari 5193, Müslim 1436, Nəvəvi "Riyadus Salihin" 281, "Buluq əl-Məram" 1021.
[307] İbn Qudamə "İsbat Uluv" səh: 102, Buxari "Tarix əl-Kəbir" 1/201/623.
[308] Zəhəbi "Uluv" №317, səh: 121,122, İbn Həcər "Təhzib" 12/386, № 2840, Əhməd "Musnəd" 2336, 2496, Darimi "Raddu Alə Cəhmi" 27.

istəyənə verərəm, Bağışlanma diləyəni bağışlayaram bu da günəş doğana qədər davam edər”[309].

***Sələf İmamlarının Bu Barədə Olan Sözləri:*** Ömər K: “Məni saxlayıb uzun müddət şikayət etdən qadının sözlərindən sonra” dedi – Bu qadının şikayətini Allah yeddi səma üzərindən eşitdi”[310]. ***«Sən məni azdırıb yoldan çıxartdığın üçün mən də sənin düz yolunun üstündə oturub insanlara mane olacağam. Sonra onların qarşılarından və arxalarından, sağlarından və sollarından gələcəyəm və Sən onların əksəriyyətini şükr edən görməyəcəksən».*** *(əl-Əraf 14-17).* İbn Abbas K deyir ki: «Sonra onlara qarşılarından – onları axirətləri haqqında şübhəyə salacağam, sonra onlara arxalarından gələcəyəm – yəni onlara dünyanı çox sevməyə təşviq edəcəyəm, sağlarından gələcəyəm – yəni dinlərində onları tərəddüdə salacağam (yaxşı əməllər tərəfdən), sollarından gələcəyəm – yəni onları günah etməyə həvəsləndirəcəyəm. Şeytan üstlərindən deməyə (cürət etmədi) bacarmadı. Çünki bilirdi ki, üstlərində nəzarətçi Allahdır. İmam Şabi Σ deyir ki: «Uca və Böyük olan Allahın rəhməti onların üzərindən enər»[311]. Qatadə Σ rəvayət edir ki, Yunus A buyurdu: «Ya Rəbbim! Sən göydəsən, bizlər isə yerdə. Sənin qəzəbinin və rizanın əlaməti nədir?». Allah: «Sizə ən xeyirli idarəçiləri başçı təyin etmişəmsə bu sizdən razı olduğumun əlamətidir. Əgər ən şərli idarəçini sizə başçı təyin etmişəmsə bu da sizə olan qəzəbimdir»[312]. İbn Abbas K deyir ki: “İstənilən bir şey barəsində düşün, lakin Allahın Zatı barəsində düşünmə. Həqiqətən yeddi səma ilə Kürsi arasında yeddi min il vardır. O, isə bütün bunlardan yuxarıdadır”[313]. İbn Abbas K deyir ki: “Allah Musa ilə səmadan gələn nida ilə danışdı. Allah isə səmada idi”[314]. Əbu Muti Σ deyir ki, Əbu Hənifədən Σ: “Mən Rəbbimin səmada, yoxsa yerdə olduğunu bilmirəm deyən kimsə barəsində soruşdum”. O, dedi: «Bu kimsə kafir olur». Çünkü Allah buyurur: ***«Rahmən ərşin üstünə yüksəldi».*** *(Ta ha 5).* Onun Ərşi isə yeddi səmanın üstündədir. Mən: «Əgər o, Ərşin üzərindədir dediyi halda, bilmirəm Ərş səmadadır, yoxsa yerdədir” desə? O, dedi: «Yenə o, kafirdir. O, Allahın səmada olmağını

---

[309] Darimi, İbn Məcə 1367, əl-Albani “İrva” 450 səhih.
[310] Buxari 2/494.
[311] Təbəri «Camiul Bəyan» 5/133-136, Ləlakai «Usulu Etiqad» 3/397.
[312] Əhməd “Musnəd”, Darimi “Raddu Alə Cəhmi” 59.
[313] İbn Qudamə “İsbat Uluv” səh: 34, Beyhəqi “Əsməu Və Sifət” səh: 420. İsnadda Asim İbn Əli və atası zəif ravilərdir. Lakin əsər digər bir hədis ilə gücləndirirlir: Peyğəmbər 3 buyurdu: “Allah barəsində düşünməyin, lakin onun yaratdıqları barəsində düşünün...”. əl-Albani “Səhih Silsilə” 1788.
[314] Buxari “Xalqu Əfalul İbəd” səh: 53.

inkar edir»[315]. Bir qadın Allah haradadır? deyə soruşuduqda İmam Əbu Hənifə Σ: «Allah səmadadır, yerdə deyil» cavabını verdi. Bəs Allah: ***«Siz harda olsanız, o sizinlədir».*** *(əl-Hədid 4)* sözünə nə deyirsən?» sualına isə belə cavab verdi. «Bu sənin bir kimsəyə məktub yazıb mən səninlə bərabərəm deməyin kimidir. Halbuki sən onun yanında deyilsən»[316]. Abdullah İbn Mubarək Σ- deyir ki: "Biz Rəbbimizi belə tanıyırıq: O, yeddi səma üzərində, Ərşə İstiva etmişdir, məxluqatından ayrıdır və biz Cəhmilərin dediyi kimi də demirik, o filan yerdədir"[317]. Suleyman İbn Tarhan ət-Teymi Əbu əl-Mutamar əl-Basri Σ deyir ki: "Əgər məndən soruşsalar ki, Uca və Böyük olan Allah haradadır?". Mən: "Səmada" deyərəm. Əgər məndən soruşsalar: "Onun Ərşi göylər yaradılmamışdan öncə harada idi?". Mən: "Su üzərində" deyərəm. Əgər məndən soruşsalar: "Su yaradılmamışdan öncə Ərş harada idi?". Mən: "Bilmirəm?" deyərəm. Buxari Σ bu sözlərə əlavə olaraq deyir ki: "Bu da Allahın buyurduğuna uyğundur: ***"Onlar** (yaranmışlar)* ***Allahın elmindən Onun Özünün istədiyindən başqa heç bir şey qavraya bilməzlər".*** *(əl-Bəqərə 255)* Allahın izin verdiyindən başqa[318]. Səid İbn Amir Σ deyir ki: "Cəhmilər öz sözlərində Kitab Əhli olan Yəhudi və Xaçpərəstlərdən pisdirlər. Yəhudi və Xaçpərəstlər Allahın Ərşin üzərində olduğunu qeyd edirlər. Lakin bu Cəhmilər deyirlər ki: "Ərşin üzərində heç nə yoxdur"[319]. Muhəmməd İbn Yusuf Σ- deyir ki: "Kim desə ki, Allah Ərşin üzərinə İstiva etməyib artıq küfr etmişdir. Kim də desə ki, Allah Musa ilə danışmayıb artıq küfr etmişdir"[320]. İmam Zəhəbi Σ Cariyə ilə bağlı hədisi rəvayət etdikdən sonra deyir ki: "Biz görürük ki, istənilən bir kimsə Allah haradadır? Deyə soruşulduqda fitrəti onu qabaqlayaraq: "Səmadadır" deyir. Bu xəbərdə bizim üçün iki qayda vardır: 1. Şəriətdə **"*Allah Haradadır?*"** sualının verilməsinin caiz olması. 2. Soruşulanın isə **"*Səmada*"** deyə cavab verməsinin caiz olmasıdır. Kim ki, bu iki qaydaya zidd gedirsə artıq Peyğəmbərin 3 gətirdiyi şəriətə qarşı çıxmış olur"[321]. Əbul Həsən əl-Əşari Σ dedi ki: "Bu hədis açıq-aydın dəlildir ki, Uca Allah səmada, Ərşin

---

[315] Əbu İsmail əl-Ənsari əl-Faruk əsəri "Fikhul Əbsat" səh: 46, İbn Teymiyyə "Məcmuul Fətava" 5/48, Zəhəbi "Uluv" səh: 101,102, İbn Qudamə "Uluv" səh: 116.
[316] Beyhəqi «əl-Əsma və əs-Sifət» 429, Zəhəbi «Uluvv» müxtəsər: s. 135.
[317] İmam Buxari "Xalqu Əfalul İbəd" səh: 25, İmam Darimi "Cəhmilərə Rədd" səh: 272, İbn Qudamə "İsbat Uluv" səh: "48, Beyhəqi "Əsməu Və Sifət" səh: 427.
[318] İmam Buxari "Xalqu Əfalul İbəd" səh: 37,42, Zəhəbi "Uluv" 130, Lələkai "Usulu Etiqadi" 3/401.
[319] İmam Buxari "Xalqu Əfalul İbəd" №18, səh: 7,26, Zəhəbi "Uluv" №430, səh: 158.
[320] İmam Buxari "Xalqu Əfalul İbəd" səh: 42.
[321] İmam Zəhəbi "Uluv" 28.

üzərindədir”[322]. Müaviyə İbn əl-Həkəm əs-Sələmi K rəvayət edir ki, bir cariyəm var idi. Çöldə qoyun otarırdı. Bir gün canavar qoyunlardan birini yediyinə görə çox qəzəbləndim. Hətta cariyəyə sillə də vurdum. Peşmançılıq çəkdim və hadisəni Rəsulullaha 3 danışdım. Allah Rəsulu buyurdu: «Cariyəni yanıma çağır». Cariyə gəldikdə, Rəsulullah 3 buyurdu: «Sən mömінəsən?» O, da bəli dedikdə Rəsulullah 3 buyurdu: «***Əynəallah*** – Allah haradadır?» deyə buyurdu. Cariyə: “Səma üzərində”. Peyğəmbər: “Bəs mən kiməm?”. Cariyə: «Sən Allahın Rəsulu». Peyğəmbər: “Onu azad et! Çünki o, mömіnədir” deyə buyrdu[323].[324]. Kəlam əhlindən olan Abdullah İbn Kulləb deyir ki: “Məxluqatın ən xeyirlisi, Allahın seçdiyi, məxluqlar içərisində Allahı ən çox tanıyan Muhəmməd 3 ***“Allah Haradadır?”*** sualının verilməsinə, ***“Səmadadır”*** cavabının doğru olmasına və cavab verənin iman əhli olmasına icazə verməsi açıq-aydın buna dəlildir. Lakin Cəhm İbn Saffan[325] və onun tərəfdarları (həmfikirləri) Allah haradadır sualının verilməsini qadağan edirlər. Əgər bu tərzdə sual vermək qadağan olunsaydı Peyğəmbər 3 daha haqlı idi cariyənin bu kimi cavabına etiraz edib: Bu cür demək olmaz, çünki bu cür demək Allaha məkan verməkdir (məhdud) etməkdir”. Lakin əksinə Peyğəmbər 3 bu cür suala verilən cavabı imandan saydı. Bu sözlərdə bir neçə görüş vardır: 1. ***Allah haradadır?*** Sualının verilməsinin caiz olması. 2. ***Səmadadır*** – cavabının doğru olması. 3. Bu da icmadır[326]. Əbul Həsən əl-Əşari Σ “əl-İbanə” kitabında böyük bir başlıq açmışdır ***İstiva*** (Uluv) barəsində. O, deyir ki: “Bir kimsə soruşa ki, Allahın İstivası barəsində nə düşünürsüz? Ona cavabımız: Uca və Böyük olan Allahın Ərşin üzərinə İstivası Onun əzəmətinə yaraşır bir şəkildədir. ***«Rahmən ərşə istiva etdi».*** *(Ta ha 5).* ***«Pak söz ona tərəf yüksələr».*** *(Fatir 10).* ***«Xeyir! Allah onu öz dərgahına qaldırmışdı».*** *(ən-Nisa 158).* **Firon dedi:** ***«Ey Haman! Mənim üçün bir qəsr tik ki, bəlkə göylərin yollarına yetişim və Musanın Rəbbini görüm. Doğrusu mən onu yalançı***

---

[322] İbn Batta “İbanə” səh: 103.
[323] Müslim 537.
[324] Müslim 537, «əl-Fiqhul Əbsat» s. 47,48.
[325] ***Cəhmilər*** **-** Əbu Muxriz kimi tanınır. H. 128-ci il Mərvəzdə öldürülür. İbn Teymiyyə “əl-Fətava əl-Hənbəliyə əl-Kubra” deyir ki: “(Allahın bütün sifətlərini inkar edənlərdir) İlk olaraq bu fikirləri Cud İbn Dirhəm təbliğ etməyə başlamışdır. Ondan da Cəhm İbn Saffan bu fikirləri alır və yaymağa başlayır. Cəhmilər də ona nisbət edilərək belə adlanmışlar. Rəvayət edilir ki: Cud İbn Dirhəm bu görüşləri (fikirləri) Abana İbn Səbanadan, o da Talutdan, o da öz əmisi Lubeyd İbn əl-Əsləmdən almışdır. Lubeyd İbn Əsləm isə Peyğəmbər 3 sehr (cadu) edən Yəhudi sehirbaz idi”.
[326] İbn Teymiyyə “Tarud Aql Məa Nəql” səh: 6/193, “Məcmuul Fətava” 5/319, İbn Favraq “Məqalət İbn Kulləb”.

***sayıram».*** *(əl-Mumin 36-37).* Firon belə düşünürdü ki, Musanın A Allahın səmada olması barəsində olan moizələri yalandır. ***«Göydə olanın yeri titrədib sizi onun dibinə göndərməyəcəyinə əminsinizmi. Göydə olanın sizin üstünüzə daş yağdıran bir yel göndərməyəcəyinə arxayınsınızmı?»*** *(Mulk 16,17).* Allah – *subhənəhu və təalə* - səmada olduğunu, səmalar üzərində yerləşən Ərşin üzərinə İstiva etdiyini buyurdu. Nə ki, səmada yerləşir, onları səmalara daxil etmək olar (Səmadadır deyə adlandırmaq olar). Ərş isə səmalarda olan ən əzəmətli məxluqdur. Allah bütün səmaları əhatə edir deyə buyurmadı, əksinə səma üzərində (Ərşin üzərinə İstiva) etdiyini buyurur. Allah: ***"Məgər görmürsünüz ki, Allah yeddi göyü*** *(bir-birinin üstündə)* ***qat-qat necə yaratdı?! Orada ayı bir nur, günəşi də bir çıraq etdi".*** *(Nuh 15-16).* Allah buyurur ki: ***"Orada ayı bir nur etdik"*** Lakin bu o, demək deyil ki, Ay bütün səmaları əhatə edir. Biz görürük ki, necə bütün müsəlmanlar dua etdikləri zaman əllərini səmaya doğru qaldırırlar. Çünki Uca və Böyük olan Allah səmalar üzərində yerləşən Ərşin üzərinə İstiva etmişdir. Əgər Uca və Böyük olan Allah Ərşin üzərində olmasaydı müsəlmanlar dua edərkən əllərini səmaya doğru qaldırmazdılar. Kifayədir ki, onlar namaz vaxtı əllərini yerə doğru uzatmırlar". İbn Qudamə Σ rəvayət edir ki, Əbu Hənifə Σ dedi: "Kim Allahın səmada olduğunu inkar edərsə artıq küfr etmişdir (kafir olmuşdur)"[327]. İmam Məlik Σ deyir ki: "Allah səma üzərindədir, elmi isə hər yerdədir"[328]. AbdurRahman İbn Amr əl-Auzai Σ deyir ki: "O, öz Ərşi üzərindədir, Özü özünü vəsf etdiyi kimidir"[329]. Dahhaq və Vəhb İbn Munəbbih Σ deyirlər ki: "Ərş Allahın ilk yaratdığıdır"[330]. Əbu Bakr Abdullah İbn Zubeyr əl-Qureyşi əl-Humeydi Σ deyir ki: "Biz deyirik ki: Rahmən Ərşə İstiva etmişdir və kim bundan qeyrisini düşünərsə o, Allahın sifətlərini təvil edən Cəhmidir"[331]. Vəhb İbn Cərir Σ deyir ki: "Cəhmilər bidət əhlidir və onlar istəyirlər ki, biz deyək: "Allah Ərşə İstiva etməmişdir"[332]. İmam Əbu Zura əz-Razi Σ deyir ki: "Əziz və Cəlil olan Allah Ərşin üzərində, məxluqatdan ayrıdır"[333]. İmam ən-Nablusi Σ deyir ki: "Rahmən Ərşə yüksəldi. O, məxluqatından ayrıdır"[334]. İmam Muhəmməd əl-Bağdadi Σ deyir ki: "Allah Ərşə İstiva etmişdir. Bütün

[327] "İsbat Uluv" səh: 116,117.
[328] Zəhəbi "Uluv" 140, İbn Qudamə "İsbat Uluv" 115.
[329] İmam Zəhəbi "Uluv" 367.
[330] İmam Zəhəbi "Uluv" №340, səh: 127.
[331] Muhəmməd əl-Humeyyis "İtiqadu Aimmətus Sələf" səh: 71.
[332] Buxari "Xalqu Afalul İbad" №6, səh: 5.
[333] Muhəmməd əl-Humeyyis "İtiqadu Əimmətus Sələf" səh: 132.
[334] Muhəmməd əl-Humeyyis "İtiqadu Əimmətus Sələf" səh: 158.

mülk Ona məxsusdur və Onun elmi hər bir şeyi əhatə etmişdir”[335]. Şeyxulİslam İsmail əl-Nişapuri, Əbu Osman əs-Sabuni Σ deyir ki: “Mən şəhadət edirəm ki, Rahmən Ərşə İtiva etmişdir”[336]. İmam İbn Cureyc Σ deyir ki: “O, məxluqatı yaratmamışdan öncə Ərşi su üzərində idi”[337]. Muqatil İbn Həyyan Σ deyir ki: ***«Məgər görmürsənmi ki, Allah göydə və yerdə nə varsa, hamısını bilir. Aralarında gizli söhbət edən üç adamın dördüncüsü, beş adamın altıncısı Allahdır. Onlar bundan az da, çox da olsalar və harda olsalar, Allah yenə də onların yanındadır. Sonra Qiyamət günü Allah onlara etdikləri əməlləri*** *(bir-bir)* ***xəbər verəcəkdir. Allah hər şeyi biləndir».*** *(əl-Mucadələ 7).* O, Ərşi üzərindədir, elimi isə Onunladır”[338]. Muhəmməd İbn İbrahim əl-İsfəhani Σ deyir ki: Mən eşitdim ki, Əbu Zura ər-Razi Σ: “Rahmən Ərşə yüksəldi” ayəsinin təfsirini soruşdular. O, qəzəblənərək: Bu ayənin təfsiri sənin oxuduğun kimidir. O, Ərşin üzərindədir, Onun elimi isə hər bir şeyi əhatə etmişdir. Allahın lənəti olsun o, kəslərə ki, buna zidd olan bir söz söyləyərlərsə”[339]. İmam Hafiz Nueym İbn Həmməd Σ deyir ki: “Kim Allahı yaratdığı məxluqatla müqayisə edərsə o, kafirdir. Kim Allahın özü-özünü necə vəsf etdiyini inkar edərsə kafirdir. Allahın və Onun Rəsulunun Onu necə vəsf etdiyində Təşbih (bnzətmə) yoxdur”. İshaq İbn Rahaveyh Σ deyir ki: “Təşbih nə zaman baş verir? Əgər bir kimsə desə ki: Əli mənim əlimə bənzəyir və ya eşidirəm necə O, eşidir. Artıq bu Təşbihdir. Lakin Allahın buyurduğu kimi desə: Əl, eşitmək, görmək və necəliyinə varmasa, bənzətməsə bu zaman bu Təşbih sayılmır. ***«Onun bənzəri heç bir şey yoxdur. O, eşidən və görəndir».*** *(əş-Şura 11).* Biz Onu özü-özünü vəsf etdiyi kimi vəsf etməliyik”. İmam Şafii Σ “Risalə” kitabında deyir ki: “O, özünü vəsf etdiyi kimidir və məxluqatın Onu vəsf etməsindən Ucadır”[340]. Muhəmməd İbn AbdulKərim əş-Şəhristani Σ deyir ki: “***Sələflər*** – bənzətməkdən o, qədər qorxardılar ki, hətta kim ayəni oxunduğu zaman: ***“...iki əlimlə yaratdığıma”*** *(Sad 75).* əlini tərpədərsə (göstərərsə) və ya hədisi söylədiyi zaman: “Qulların qəlbləri Rəhmanın barmaqlarından iki barmağı arasındadır...” söylədiyi zaman barmaqları ilə işarə edərsə, qoy o, kimsə əlini kəssin, barmaqlarını isə çıxartsın”[341]. İbn Teymiyyə Σ deyir ki: “Kim

---

[335] Muhəmməd əl-Humeyyis “İtiqadu Əimmətus Sələf” səh: 168.
[336] Muhəmməd əl-Humeyyis “İtiqadu Əimmətus Sələf” səh: 179.
[337] Zəhəbi “Uluv” səh: 137.
[338] Zəhəbi “Uluv” səh: 138.
[339] Zəhəbi “Uluv” səh: 203.
[340] “Məcmuul Fətava” 5/195.
[341] Şəhristani “Din Və Məzhəblər Barədə Kitab” 80.

Allahın sifətlərini məxluqatın sifətlərinə oxşadaraq deyərsə: Allahın yüksəlməsi, enməsi və digər əməlləri oxşardı məxluqatın enməsinə, qalxmasına o, kimsə zəlalətə düşmüş bidət əhlidir"[342]. Əhməd İbn Hənbəl Σ deyir ki: "Allah özünü Həyy, Alim, Səmi, Basir, Rauf, Rahim adlandırmışdır. Onun bu sifətləri məxluqatda olan sifətlərə oxşar deyildir"[343]. İbn Teymiyyə Σ deyir ki: "Quran, Sünnə və sağlam ağıl şahidlik edir ki, Allah yaratdığı məxluqatdan heç birinə bənzər deyildir..."[344]. İbn Teymiyyə Σ deyir ki: "Kim desə ki, Allah müəyyən bir yerdədir və ya Allah məxluqatı ilə bir yerdədir, məxluqat və göylər onu əhatə etmişdir, yaratdıqlarından bir çoxu Ondan hündürdədir, bəziləri Ondan aşağıdır belə bir kimsə zəlalətə düşmüş bidətçidir"[345]. İbn Teymiyyə Σ deyir ki: "Kim desə ki: "Allahın Ərşə və ya başqa bir yerə ethiyacı vardır o, kimsə zəlalətə düşmüş bidət əhlidir"[346].

Sonda sizə Şeyx əl-Albaninin Σ başına gəlmiş ibrətli bir hadisəni qeyd etmək istəyirəm. Şeyx əl-Albani Σ deyir ki: «Həcc ziyarətində Minada idik. Bir məclisdə oturmuşduq. O, gecə bir çox cavanlarla, o cümlədən də "Ənsara Sünnə Muhəmmədiyyə" cəmiyyətinə mənsub cavanlarla da görüşdük. Bu vaxt Əhzar Universitetinin Şeyxlərindən biri yanıma daxil oldu. Eşitdi ki elm məclisidir. Məclisdə əyləşdikdə başa düşdü ki, məclis onların Vəhhabi adlandırdığı məclisdir. O: «Hörmətli Vəhhabilər![347] Siz Allahı cisimləşdirirsiniz». əl-Albani: «Bu necə ola bilər?» dedim. O: «Siz deyirsiniz ki, Allah Ərşin üzərindədir». əl-Albani: «Subhənəllah! Biz belə demirik. Allah buyurur: ***«Rahmən ərşə istiva etdi».*** *(Ta ha 5).* O: «Bəli, lakin siz deyirsiniz ki, Allahın məkanı var». Bizim aramızda mübahisə oldu. Bu da fəlsəfəyə bənzəyirdi. Çünki bu ağıl və məntiq mübahisəsi idi. Ümumən müsəlmanlar əqidə məsələlərində ağılla mübahisə etməsinlər. Çünki ağılı nəqldən (Quran və Sünnə) üstün tutan zəlalatə düşər. Bu cür insanla bir az məntiqlə mübahisə etmək məcburiyyətində qaldım. O: «Siz Allaha məkan təyin edirsiniz». Şeyx: «Səndən bir sual soruşacağam. Xahiş edirəm cavab verəsən». O: «Buyur, soruş» dedi. Şeyx: «Məkan mövcud olan bir şeydir, yoxsa yox». O: «Mövcud olan bir şeydir» dedi. Şeyx: «Bu məkan əzəlidir. Əzəldən olub, yoxsa sonradan yaradılıb?» deyə soruşdum. O: «Sonradan yaradılıb» dedi.

---

342 "Məcmuul Fətava" 5/199.
343 "Məcmuul Fətava" 5/196.
344 "Məcmuul Fətava" 5/199.
345 "Məcmuul Fətava" 5/199.
346 "Məcmuul Fətava" 5/199.
347 ***Subhənəllah!*** Şeyxə də Vəhhabi deyirlər?

Şeyx: «Biz indi məkandayıq?». O: «Bəli» dedi. Şeyx: «İndi bizim üstümüzdə səmanın birinci qatıdır və o məkandır?» deyə soruşdum. O: «Bəli» dedi. Beləcə Şeyx yeddinci səmaya qədər sadaladı. O, da bəli deyərək cavab verirdi. Şeyx: «Yeddinci səmadan sonra nə var?» deyə soruşdum. O: «Ərş» dedi. Şeyx: «Ərş məkandır, yaradılıb». O: «Bəli» dedi. Şeyx: «Ərşdən sonra nə var?». Söhbətin bu yerində o, məni qəribə bir cavabla təəccübləndirdi. O: «Kurrabiyun mələklər» dedi. Şeyx: «Sən elə bir ayə bilirsən ki, orada Kurrabiyun mələklərdən söhbət getsin?». O: «Xeyr» dedi. Şeyx: «Bəs hədis?». O: «Xeyr» dedi. Şeyx: «Çox qəribədir» dedim. Əhzar Universitetinin Şeyxisən, lakin bu məsələni bilmirsən? O: «Bizə belə öyrədiblər» dedi. Şeyx: «Yaxşı indi gəl biz səninlə müvəqqəti də olsa razılaşaq (Buna cədəl deyilir)». Yaxşı sən iddia edirsən ki, Ərşin üzərində Kurrabiyun mələklər vardı. Bəs ondan sonra nə vardır. O, bir anlığa susdu. Mən: "Kainatın sonu var, yoxsa sonsuzdur?" deyə soruşdum. O: «Sonu var». Şeyx: «Bu son bizə görə Ərşdir, sənə görə isə Kurrabiyun mələklərdir». Onlardan yuxarıda heç bir şey yoxdur, Elədir? Çünki sən dedin ki, kainatın sonu var. O: «Bəli» dedi. Deməli Sələflər dedikdə ki, Rahmən Ərşə İstiva edib sən nəyə görə elə başa düşürsən ki, onlar məkan nəzərdə tuturlar. (Ərşin üzərində məkan yoxdur Allah da oradadı). O, da susdu"[348].

# MÜXALİFLƏRİN GƏTİRDİKLƏRİ BƏZİ ŞÜBHƏLƏR VƏ ONLARA VERİLƏN CAVABLAR

***Müxaliflərin Şübhələri:*** Müxaliflər müsəlmanların qəlblərinə şübhə salmaq üçün bəzi ayələri dəlil gətirirlər. ***«Göydə olanın».*** *(Mulk 16-17).* Zahirini qəbul etsək, səmanın Allahı kölgələdiyini, Onu daşıdığını, Onu əhatə etdiyini desək düzgün olmaz. Bu sözləri söyləyən kimsə əgər bunu özündən demişsə sapıq, yox əgər başqasına nisbət edərək söyləmişsə o, təqdirdə yalançı və xətalı olmuşdur. Allahın böyüklüyünü: ***«Ən Uca və ən böyük varlıq da Odur!».*** *(əl-Bəqərə 255).* ***«O,*** *(hər şeydən)* ***Ucadır,*** *(hər şeydən)* ***Uludur!».*** *(əş-Şura 4).* Onun hər şeyi elmi ilə əhatə etdiyini (***MUHİT***)[349]: ***«Halbuki Allah kafirlərin bütün işlərini biləndir».*** *(əl-Bəqərə 19).* ***«Allahın hər şeyi öz elmi ilə ehtiva etdiyini biləsiniz deyə…».*** *(ət-Talaq 12).* Qiyamət günü yer üzünün Onun ovcunda olacağını: ***«Halbuki Qiyamət günü yer bütünlüklə onun ovcunun içində olacaq, göylər isə onun sağ əli ilə büküləcəkdir».*** *(əz-Zumər 67).* Göyü də kitab səhifəsi kimi bükəcəyini: ***«Göyü kitab səhifəsi kimi büküb***

---

[348] ət-Təqva studiyası kasset 1579, Kuveyt «İhyə ət-Turass əl-İslam».
[349] Bu İsim üçün bax: Ali İmran 120, ən-Nisa 108, 126, əl-Ənfal 47, Hud 92, Fussilət 54, əl-Buruc 20.

***qatlaycağımız gün** (Qiyamət gününü) **yadınıza salın».** (əl-Ənbiya 104).* *Göyün də Allaha ehtiyacı olduğunu:* ***«Onun izni olmadan yerə düşə bilməməsi üçün göyü tutub saxladığını görmürsənmi».*** *(əl-Həcc 65).* Bilən bir kimsə əsla yaratdıqlarından hər hansı bir şeyin Allahı kölgələdiyini, daşıdığını, əhatə etdiyini belə ağlına gətirməz.

***Həmçinin***: ***«And olsun ki, insanı biz yaratdıq və nəfsinin ona nə vəsvəsə etdiyini də biz bilirik. Biz ona şah damarından da yaxınıq».*** *(Qaf 16).* Bəli, bu ayəni oxuduqda biz fikirləşə biləik ki, Allah bizə şah damarımızdan da yaxındır. Lakin nə ilə yaxın olduğunu biz sonrakı ayədən başa düşürük. ***«Xatırla ki, sağında və solunda yazan iki mələk oturmuşdur».*** *(Qaf 17).* O, mələklər ki, insanın ağzından çıxan hər bir kəlməni qeyd edirlər.

***Həmçinin***: ***«Göylərdə də, yerlərdə də yalnız o Allahdır. Sizin gizlində də, aşkarda da nəyiniz varsa onu, tutduğunuz əməlləri O bilir».*** *(əl-Ənam 3).* Bu ayə Allahın zatıyla göydə olduğu kimi, yerdə də olduğu mənasına gəlməz. Bu cür fikirləşən çox böyük xəta etmişdir. Qurani Kərimdə olan digər bir ayə bunu çox gözəl açıqlayır. ***«Göydə də ilah** (ibadət olunan) **yerdə də ilah Odur. O, hikmət sahibidir, biləndir».*** *(Əz-Zuxruf 84)*[350]. Şübhəsiz ki, Allah göylərdə də, yerlərdə də ibadət olunan ilahdır. Göydə də, yerdə də olan hər bir şey ilah olaraq yalnız Allaha ibadət və itaət edirlər. Çünki Allahın göylərin üzərində olması sizin gizlində də, aşkarda da etdiyinizi bilməsinə əngəl törətməz. Hər nə qədər Allah zatıyla göydədisə ilahlığı (tanrılığı) isə hər iksindədir. Bunun bir bənzəri də: «Filankəs Məkkədə də əmirdir, Mədinədə də». Yəni o, kimsə hər nə qədər bu şəhərlərdən birində olursa olsun əmirliyi hər iki şəhərdə də keçərlidir. İmam Məlik Σ deyir ki: «Allah göydədir, elmi isə hər yerdədir»[351].

***Həmçinin***: ***«Can boğaza yetişdiyi zaman, siz ona baxıb durursunuz. Biz ona sizdən daha yaxınıq, amma siz görmürsünüz».*** *(əl-Vaqiə 83-85).* Allah: «*Biz Ona Sizdən Də Yaxınıq*» buyurduqda, ölüm anında ***Ölüm*** – mələyinin ölən insana yaxın olduğunu buyurur. Bəs nə üçün Allah birinci şəxsin adından danışır? Mələklər Allahın elçiləridir və onladan danışıldıqda birinci şəxsisn adından danışılır. ***"Biz onu** (Cəbrailin dili ilə) **oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə".*** *(əl-Qiyamət 18).* ***"İbrahimin qorxusu çəkildikdə və ona** (İshaqın doğulacağı haqqında) **müjdə gəldikdə Lut tayfası barəsində Bizimlə** (mələklərimizlə) **mübahisə***

---

[350] Bax: Təfsir İbni Kəsir.
[351] Əbu Davud «Məsailu İmam Əhməd» s. 263, İbn Əbdul Bərr «Təmhid» 7/138.

***etməyə başladı.*** *(Əzabın onlardan dəf edilməsini istədi)****".*** *(Hud 74).* Hər iki ayədə söhbət mələklərdən gedir. ***Həmçinin -*** Bu ayədə ölüm anı xüsusiləşdirilmişdi. Əgər biz desək ki, Allah bizə yalnız ölüm anında yaxındır, bu düz olmaz, çünkü Allah bizə hər an yaxındır. Ölüm anının xüsusiləşdirilməsi isə o, anda ölüm mələyinin yaxın olmasına görədir. Allahın bizə hər an yaxın olması isə Quran və Sünnə ilə sabitdir. Bu da duadır. ***«Bəndələrim məni səndən soruşsalar söylə ki, mən onlara yaxınam. Dua edib məni çağıranın duasını qəbul edərəm».*** *(əl-Bəqərə 186).* Burada söhbət Allahdan nə isə istəmək və Allaha ibadət etmək üçün olunan duadan gedir.

***Qayda:*** İstək duası zamanı insan bir şeyə diqqət etməlidir! Allahın adlarından öz istədiyi şeyə münasib olanını istədiyindən qabaq çəkməlidir. Məs: «Ey Rahmən olan Allah! Mənə rəhm et, məni bağışla!» «Ey qoruyan, məni qoru!» və s. Rəsulullah 3 buyurur: «Sizin dua etdiyiniz Allah sizdən hər hansı birinizin dəvəsinin boynundan da ona yaxındır»[352]. Allahın yaxın olması ucalığına və yuxarıda olmasına zidd deyildir. Çünkü bütün sifətlərində Allaha bənzər bir şey yoxdur. O, yaxın olması ilə də ucadır, ucalığı ilə də yaxındır. ***«Allah*** *(müşriklərin)* ***ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır».*** *(əs-Saffət 159).* Həsənul Bəsri Σ deyir ki: "***Allahummə -*** kəliməsi özündə istənilən növ istəyi əhatə edir". Əbu Radca əl-Ataridi Σ deyir ki: "***Allahummə -*** kəliməsində olam "***Mim***" hərifi özündə Allahın **99** İsmini əhatə edir". ən-Nadr İbn Şamil Σ deyir ki: "Kim ***Allahummə -*** deyərək Allaha dua etməyə başlayarsa artıq Allahı bütün İsimləriylə çağırmış olar".

***Həmçinin***: ***«Məgər görmürsənmi ki, Allah göydə və yerdə nə varsa, hamısını bilir. Aralarında gizli söhbət edən üç adamın dördüncüsü, beş adamın altıncısı Allahdır. Onlar bundan az da, çox da olsalar və harda olsalar, Allah yenə də onların yanındadır. Sonra Qiyamət günü Allah onlara etdikləri əməlləri*** *(bir-bir)* ***xəbər verəcəkdir. Allah hər şeyi biləndir».*** *(əl-Mucadələ 7).* ***«Siz harda olsanız, o, sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir».*** *(əl-Hədid 4).* İlk baxışdan bu ayələr insana şübhə gətirə bilər. O, sizinlə bərabərdir buyuruğu: Allah yaradılmışlar ilə qarışmış, onların yanlarındadır demək deyil. Xeyr! Allah Ərşin üzərindədir, məxluqatın üzərində ***Raqibdir*** (nəzarət edəndir). Əgər ayələrin sonlarına fikir versəniz görərsiniz ki, Allahın bizimlə bərabər olması, Onun bizim etdiklərimizi bilməsi və görməsi ilədir. Elm, qüdrəti ilə hər bir şeyi idarə edən, əhatə edən, himayə edən haqqında düşünmək

---

[352] Buxari, Müslim.

ki, o məxluqlarla, naqislərlə, günahkarlarla birlikdədir. Bu ağla sığmazdır. Sufyan əs-Souri Σ deyir ki: ***“...Allah yenə də onların yanındadır”.*** Yəni: Elimi ilə onlarladır”[353]. Sələflər (Səhabə və Tabiinlər) bu barədə icma etmişlər: “O, Ərşi üzərindədir, elimi isə hər bir yerdədir”[354]. İbn Kəsir Σ bu ayənin təfsirində deyir ki: “Məhz bu səbəbə görə bir çox insanlar deyirlər ki, İcma vardır **“*Yanında*”** kəliməsinə görə. Yəni, burada qəsd olunan “Yanındadır Elimilə” deməkdir[355].

Əhli Sünnə Vəl Cəmaat alimləri Allahın yaratdıqları ilə bərabər olmasını, Zatı ilə deyil məhz elmi ilə onlarla bərabər olması şəkilində açıqlamışlar. Burada məqsəd sapıq Hüluliyyəçilərə cavab verməkdir[356]. Pak və nöqsansız olan Allahın yaratdıqlarıyla bərabər olması Ona yaraşır bir bərabərlik olub əsla yaradılmışların bir-birləriylə olan bərabərliyi kimi deyildir. Heç şübhəsiz ki, onların dəlilləri Allahın həm zatıyla yaratdıqlarının üstündə, həm də onlarla bərabər olduğunu ifadə etməkdədir. Bunların hər iksinin də sübut və dəlili güclüdür. Allahın bu buyurduğunda hər iksinə də dəlil vardır. ***«Göyləri və yerləri altı gündə xəlq edən, sonra ərşin üzərinə yüksələn*** *(istiva edən)* ***Odur. O, yerə girəni də, yerdən çıxanı da, göydən enəni də, göyə qalxanı da bilir. Siz harda olsanız O, sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir!».*** *(əl-Hədid 4).* Bu ayədə Allah yaradılmışların (məxluqatın) ən üstündə, ən yüksəkdə olan Ərşə İstiva etdiyini bildirdiyi kimi, bizimlə bərabər olduğunu da bildirmişdir. Yüksəkliklə bərabərlik arasında bir ziddiyyət yoxdur. Bir şey həm zatı ilə yüksəkdə də ola bilər, həm də ona bərabərlik nisbət edilə də bilər. Əgər biz Allahın yaratdıqlarından olan Aya baxsaq görərik ki, o səmada yerləşdirilmişdir. Bununla bərabər o, səfərdə olan hər bir kəsə hara gedirsə getsin onunla birlikdədir. Halbuki Ay göydədir və

---

[353] Zəhəbi “Uluv” 139.

[354] Zəhəbi “Uluv” 572.

[355] Bax: Fəxrəddin Razi “Məfətihal Qeyb” ayənin təfsiri.

[356] ***Hululiyyə –*** Allahın Zatıyla hər yerdə olduğunu qeyd edənlərdir. Onlar Allahın ***Məiyyə –*** Birlikdə, bərabər olmaq sifətində həddi aşaraq Allahın ona yaxın olan (əl-Mukərrəbun) şəxslərə hulul etdiyini (yəni nüfuz etmək, girmək, iki şeyin bir şeymiş kimi birləşməsini) irəli sürən sapıq firqədir. Onlara görə kim nəfsini itaətlə tərbiyə edər, dünya ləzzətləri və şəhvətlərinə səbr edərsə Allaha yaxın olanların (əl-Mukərrəbun) məqamına yüksəlir. Sonra o, bəşəriyyət sifətlərindən təmizlənincəyə qədər, saflaşmaya və saflaşmış olanların dərəcəsinə yüksəlməyə davam edəcəkdir. Saflaşma əsnasında bəşəriyyətdən bir parça da belə qalmadıqda İsa İbn Məryəmə hulul edən Allahın ruhu ona da hulul edər. O, zaman istədiyi kimi olan şeydən başqasını diləməz və əməllərinin tamamı Allahın feli olur, sonunda da Allaha birləşərək, Allah olur!? AbdulQahir əl-Bağdadiyyənin bölümünə görə **11** qurupdur. Bunlar: ***Hululiyyə, Səbəiyyə, Beyaniyyə, Cənahiyyə, Hatabiyyə, Şurayiyyə, Nemiriyyə, Rizamiyyə, Mukannaiyyə, Hulmaniyyə, Hallaciyə və Azafira.*** Hululiyyə eyni zamanda müşəbbihlərin (bənzədənlərin) həddi aşanlarıdır. Rafizilər içərsində də Allahın imamlara Hulul etdiyini deyənlər də vardır. Bax: «Məqalətul İslamiyyə» 1/81,82, «Fərq Beynəl Firaq» s. 198,205.

bizimlə bərabər hərəkət etməkdədir. Ayın bərabər olması onun işıq saçması və görülməsinə görədir. Ay isə Allahın ayələrindən ən kiçiyidir. Bir qadın Allah haradadır? deyə soruşuduqda İmam Əbu Hənifə: «Allah səmadadır, yerdə deyil» cavabını verdi. Bəs Allah: ***«Siz harda olsanız, o sizinlədir».*** *(əl-Hədid 4)* sözünə nə deyirsən?» sualına isə belə cavab verdi. «Bu sənin bir kimsəyə məktub yazıb mən səninlə bərabərəm deməyin kimidir. Halbuki sən onun yanında deyilsən»[357].

***Həmçinin***: Ubadə İbn Samit K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «İmanın ən üstünü harada olursansa ol, Allahın səninlə bərabər olduğunu bilməkdir»[358]. Bu hədis, bu ləfzlə hədis alimləri tərəfindən zəif qəbul edilmişdir[359]. Əyyub Səhtiyani Σ Mutəzilə və Cəhmilər barədə deyir ki: "Onların (etiqadının) əsası: Səma üzərində heç nə yoxdur – deməkdir"[360]. ***«O, Əvvəldir, Axırdır, Zahirdir, Batindir».*** *(əl-Hədid 3).* Muqatil İbn Həyyan Σ deyir ki: "Sən ***Əvvəlsən***, səndən əvvəl heç bir şey yoxdur. Sən ***Axırsan***, səndən sonra heç bir şey yoxdur. Sən ***Zahirsən***, Sən hər bir şeyin üzərindəsən (sənin üstündə heç bir şey yoxdur). Sən ***Batinsən***, sən hər bir şeydən yaxınsan (Səndən o, tərəfə heç bir şey yoxdur). Yəni, gücü və elimi ilə hər bir şeyə yaxındır, Özü isə Ərşin üzərindədir və O, hər bir şeydən xəbərdardır"[361].

## ALLAHIN Ψ MƏİYYƏ – BİRLİKDƏ, BƏRABƏR OLMAQ SİFƏTİ

***Məiyyə*** – birlikdə olmaq sifəti iki cürdür:

**1. *Ümumi*** – yəni Allah elmi ilə, qüdrəti ilə, tədbiri ilə (işləri düzüb qoşmaq və idarə etməsi ilə) hamı ilə bərabərdir. Zatı ilə yox. Heç bir şey ondan gizli deyildir. ***«Çünki mən sizinlə bərabərəm. Eşidirəm və görürəm».*** *(Ta ha 46).* ***«Bir də səbr edin. Allah səbr edənlərlə bərabərdir».*** *(əl-Ənfal 46).* ***«Həqiqətən Allah ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir».*** *(ən-Nəhl 128).* Aişə O deyir: «Bir qadın ərindən şikayət etmək üçün Rəsulullahın 3 yanına gəlir. Mən otağın bir küncündə olmağıma baxmayaraq onların nə barədə

---

[357] Beyhəqi «əl-Əsma və əs-Sifət» 429, Zəhəbi «Uluvv» müxtəsər: s. 135.
[358] Təbərani «əl-Kəbir», «əl-Əvsat» bax: Heysəmi «Məcmauz Zəvaid» 1/60, Əbu Nuaym «Hiylətul Əvliya» 6/124, Suyuti «Cəmius Sağir» 1/49.
[359] Zəif hədis. əl-Albani «Daiful Cəmius Səğir» 1002, «Zəif Hədislər Silsiləsi» 2589. Lakin Abdullah İbn Muaviyə əl-Ğadiridən K gələn rəvayətdə: «Nəfsin təmizlənməsi (yaxşılığı) harada olursansa olsun Allahın onunla bərabər olduğunu bilməsidir» Beyhəqi «Sünnən Kubra» 4/95, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1046.
[360] Zəhəbi "Muxtəsər Uluv" 132, Əhməd "Musnəd" 6/457, 27627, İbn Batta "İbanə" 3/194.
[361] Beyhəqi "Əsmə" 2/173.

söhbət etdiklərini eşitmədim. Lakin Allah eşidib ayə nazil etdi. ***«Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi. Allah sizin danışığınızı eşidir. Həqiqətən Allah eşidən və görəndir».*** *(əl-Mucadələ 1)»*[362].

**2.** ***Xüsusi*** – yəni Allah elmi, qüdrəti ilə yalnız Peyğəmbərlərlə, möminlərlə, müsəlmanlarla birlikdədir. ***«Müşriklərin hamısı səninlə vuruşduğu kimi siz də onlarla vuruşun və bilin ki, Allah müttəqilərlədir».*** *(ət-Tövbə 36).* ***«Allah həqiqətən möminlərlədir».*** *(əl-Ənfal 19).* Rəsulullah 3 Əbu Bəkr K ilə mağarada olarkən Əbu Bəkr K müşrikləri gördükdə qorxaraq: «Allaha and olsun ey Allahın Rəsulu, onlardan biri ayağının altına baxsa bizi mütləq görəcəkdir. Rəsulullah 3 ona Allahın buyurduğu şəkildə: ***«Qəm yemə, Allah bizimlədir».*** *(ət-Tövbə 40).* «Üçüncüləri Allah olan iki kişi barəsində sən nə düşünürsən»[363]. O, halda buradakı bərabərlik yardım və düşmənlərdən qorumaq mənasındadır. ***Həmçinin*** **–** Allah Musa və Haruna E müraciət edərək: ***"****(Allah)* ***buyurdu: "Qorxmayın, Mən də sizinləyəm,*** *(hər şeyi)* ***eşidirəm və görürəm!".*** *(Ta ha 46).* ***Həmçinin*** **-** Peyğəmbər 3 buyurdu: «Allah zatıyla yüksəkdə olmasına baxmayaraq namaz qılanın qarşısındadır. Onun üzünə baxar»[364]. Yüksəkliklə, qarşıda olmaq arasında bir ayrılıq yoxdur. Bir şey həm yüksəkdə həm də qarşıda ola bilər. Çünki qarşıda olmaq yerdə olmaq demək deyil. Məs: Doğan günəşə baxan kişi, onun yəni günəşin qarşısında olduğunu söyləyir. Lakin günəş göydədir. İbn Teymiyyə Σ deyir ki: "Allahın məxluqatı ilə bərabər olması ayələrdən aslı olaraq dəyişilir. ***«Göyləri və yerləri altı gündə xəlq edən, sonra ərşin üzərinə yüksələn*** *(istiva edən)* ***Odur. O, yerə girəni də, yerdən çıxanı da, göydən enəni də, göyə qalxanı da bilir. Siz harda olsanız O, sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir!».*** *(əl-Hədid 4).* Ayədən açıq-aydın görsənir ki, Allahın məxluqatı ilə bərabər olması Allahın insanları görməsi, onlardan xəbərdar olmasıdır. (Elmi, eşitməsi, görməsi, bilməsi) Allahın bəndələrilə olması elmilədir və bu fikirdə ilk əsr imamları olmuşlar"[365].

***Nəticə:*** 1) Allahın yaratdıqları ilə bərabər olması Quran, Sünnə və Saleh Sələflərin icması ilə sabitdir. 2) Allahın yaratdıqları ilə bərabər olması Onun Ucalığına və Əzəmətinə yaraşır tərzdə olan bir haqqdır və bu

---

[362] Buxari.
[363] «əl-Lulu Vəl Mərcan» 1540, Buxari, Müslim, Əhməd 1, Tirmizi 3096.
[364] Buxari, Müslim, Məlik 1/173, Əhməd 2/6,29, Nəsai 2/51, İbn Məcə 731, Beyhəqi «Əsmə və Sifət» s. 465. əl-Albani «Səhihul Tərğib» 1/186,188, «Səhihul Cəmius Səğir» 753.
[365] "Fətava əl-Həməviyyə".

yaradılmışların bir-birilərilə bərabər olmalarına bənzəməz. 3) Allahın yaratdıqları ilə bərabər olmasının mənası, Allahın məxluqatından elmi, eşitməsi, görməsi, bilməsi ilə xəbardar olmasıdır. 4) Buradan belə anlaşılmaz ki, Allah yaratdıqları ilə eyni məkanı paylaşdırır. 5) Allahın yaratdıqları ilə bərabər olması Onun Ərşin üzərinə İstiva etməsinə zidd deyildir. Əgər səndən: «Bərabərlik Allahın zatı sifətlərindəndir, yoxsa feli sifətlərindəndir?» deyə soruşularsa cavabımız: «Ümumi bərabərlik Allahın zatı sifətlərindəndir. Çünki bunlar əzəldən əbədi Allahda vardır. Xüsusi bərabərlik isə Allahın feli sifətlərindəndir».

# ALLAHIN Ψ KƏLAM SİFƏTİ

Bu xüsusda da insanlar çaşqınlığa düşmüşlər. Əhli Sünnə vəl Cəmaata görə Allah hər zaman istədiyi vaxt danışır. Müxaliflərin dediyi kimi, Allahın kəlam sifəti ondan ayrı və məxluq deyildir. Kəlam Allahın zatı sifətlərindəndir. Allah, Adəm və Həvva E ilə səslə danışmış, Musa A ilə vasitəsiz danışmış, həmçinin də Qiyamət günü qulları ilə tərcüməçi olmadan danışacaqdır. ***«Allahdan daha doğru danışan kim ola bilər».*** *(ən-Nisa 87,122).* ***«Rəbbin sözü düzgün və ədalətli şəkildə tamam oldu».*** *(əl-Ənam 115).* ***«Biz Peyğəmbərlərin bəzisini digərindən üstün etdik. Allah bunlardan bəzisi ilə danışmışdır».*** *(əl-Bəqərə 253).* İmam Əbu Hənifə Σ deyir: «Allah öz kəlamı ilə danışır. Kəlam Onun əzəli sifətidir», «Allah danışır, lakin bizim danışmağımız kimi deyildir»[366].

***«Xatırla ki, o zaman*** *(Qiyamət günü)* ***Allah buyuracaq: Ya Məryəm oğlu İsa! Sənmi insanlara: Allahla yanaşı məni və anamı da özünüzə ilah bilin! demişdin?»*** *(əl-Maidə 116).* Allahın Qiyamət günü İsa A ilə danışması onun ilah olmamasını sübut etmək üçün olacaqdır.

***«Rəbbi onlara*** *(Adəm və Həvvaya)* ***müraciət edib buyurdu: Məgər mən sizə bu ağaca*** *(yaxınlaşmağı)* ***qadağan etməmişdimmi?».*** *(əl-Əraf 22).* Buradakı səsləniş, nida onların günah etmələrindən sonra olmuşdur. Həmçinin Qiyamət günü Adəm A ilə danıışması. Əbu Səid əl-Xudri K rəvayət edir ki, Peyğəmbər 3 buyurdu: «Allah (Qiyamət günü): «Ey Adəm!» deyə buyurur. Adəm: «Ya Rəbbim! Mən sənin qarşındayam. Əmr et, hər əmrini yerinə yetirim və hər xeyir bütünlüklə sənin əlindədir» deyə cavab verir. Allah ona səslə: «Soyundan Cəhənnəmə girəcəkləri seçib çıxarmağı əmr edir!». Adəm: «Ya Rəbbim! Cəhənnəmə girənlərin sayı nə qədərdir?» deyə soruşur. Allah: «Hər min nəfərdən **999**-zu! Hər bir hamiləli qadının bari-həlmini (vaxtından əvvəl) yerə qoyması və uşaqların

---

366 «Fikhul Əkbər» s. 58,59.

saçlarının ağaracağı zaman o, zamandır. ***«İnsanları sərxoş görərsən, halbuki onlar sərxoş deyillər. Bu ancaq Allahın əzabının şiddətli olmasındandır!».*** *(əl-Həcc 2).* Peyğəmbərin 3 bu cavabı oradakılara (səhabələrə) çox ağır gəldi. Elə ki, hətta üzlərinin rəngi də dəyişdi. Oradakılar: «Ya Rəsulullah! (Cəhənnəmdən qurtulan) Bu mindən bir nəfər kimdi?» deyə soruşdular. Peyğəmbər 3 buyurdu: «Sevinin ki, sizdən bir nəfərə Yəcuc və Məcucdan min nəfər» deyə buyurdu. Sonra sözünə davam edərək: «Nəfsim əlində olan Allaha and olsun ki, mən sizlərin Cənnət əhlinin dörddə birini təşkil edəcəyinizə ümüd edirəm» deyə buyurdu. Sonra Allaha həmd etdik və təkbir gətirdik. Sonra yenə də: «Nəfsim əlində olan Allaha and olsun ki, mən sizlərin Cənnət əhlinin üçdə birini təşkil edəcəyinizə ümüd edirəm» deyə buyurdu. Bundan sonra biz yenə də Allaha həmd etdik və təkbir gətirdik. Sonra Peyğəmbər: «Nəfsim əlində olan Allaha and olsun ki, mən sizlərin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümüd və arzu edirəm» deyə buyurdu. Çünki ümmətlərə nisbətdə sizin məsəliniz qara öküzün dərsi üzərindəki ağ bir tük kimidir (Başqa rəvayətdə: «Ağ öküzün dərsi üzərindəki qara tük kimi») və ya Eşşəyin ön ayaqlarının iç tərəfində olan dairə formasında möhür kimi»[367].

***«Musaya vəd etdiyimiz vaxt gəlib çatanda Rəbbi onunla*** *(arada heç bir vasitə olmadan)* ***danışdı».*** *(əl-Əraf 143).* ***«Allah Musa ilə sözlə danışdı».*** *(ən-Nisa 164).* Musa A ilə heç bir mələyin köməyi olmadan, vasitəçi olmadan danışmışdır. ***«Biz Musanı Tur dağının sağ tərəfindən səslədik».*** *(Məryəm 52).* ***«Yadına sal ki, bir zaman Rəbbin Musaya belə buyurmuşdu: Get o, zalım tayfanın yanına».*** *(əş-Şuəra 10).* İmam Əbu Hənifə Σ deyir: ***«Allah Musa ilə sözlə danışdı».*** *(ən-Nisa 164)* ayəsində buyurduğu kimi Musa A Allahın kəlamını eşitdi. Şübhəsiz Allah Musa ilə danışmadan öncə də Mutəkəllim (danışıcı) idi», «Allah Musa ilə əzəli sifəti olan kəlamıyla danışmışdır»[368]. Başqa bir yerdə: «Biz Allahın Musa A ilə danışdığına da iman, təsdiq və təslimiyyət olaraq söləyirik»[369]. Əbu Yəla, İmam Əhməd Σ belə dediyini rəvayət edir: «Mən atamdan, Allah A Musa ilə danışdıqda səs ilə onunla danışmadı deyən bir topluluq haqqında soruşdum». Atam: «Allah bir səs ilə danışdı və biz bu hədisləri gəldikləri kimi rəvayət edirik»[370].

***«Allah həmin gün onlara xitab edib belə buyuracaqdır: Peyğəmbərlərə nə cavab verdiniz?»*** *(əl-Qəsəs 65).* ***«Rəhmli Allahda***

---

[367] Buxari, Müslim.
[368] «Fikhul Əkbər» s. 58,59.
[369] «Əqidətul Təhaviyyə» əl-Albani təhqiqi ilə s. 293.
[370] «Tabaqatul Hanabilə» 1/185.

*(onlara)* ***salam deyiləcəkdir».*** *(Yasin 58).* Rəsulullah 3 buyurur: «Qiyamət günü Allah ilə qulun arasında heç bir tərcüməçi (vasitə) olmadan Allahın danışmadığı heç bir qul yoxdur»[371].

Möminlərdən fərqli olaraq Allahın Qiyamət günü ***«Allah onlarla danışmaz…».*** *(əl-Bəqərə 174).* ***«Allah ilə olan əhdlərini və andlarını ucuz bir qiymətə satan şəxslərə axirət nemətlərindən heç bir pay yoxdur. Allah Qiyamət günündə onları dindirməz….».*** *(Ali-İmran 77).* Onlarla danışmaması onlar üçün bir əzabdır. ***Allah buyurar: «Orada zəlil, məyus vəziyyətdə durub qalın və mənə heç bir şey deməyin».*** *(əl-Muminun 107).*

Bu ayələrdən göründüyü kimi Allah kəlam sifətinə malikdir və yaradılmış məxluqların səs və həriflərinə bənzəməz. Onun danışması vəhiydir. Peyğəmbər 3 buyurur: «Allah bir əmri vermək istədikdə vəhy ilə danışır»[372]. Allahdan daha doğru söz söyləyən olmadığı üçün hər bir şeyi hər baxımdan gözəl bilən də odur.

# QİYAMƏT GÜNÜ MÖMİNLƏRİN RƏBLƏRİNİ GÖRMƏLƏRİ[373]

Əhli Sünnə Vəl Cəmaat yəni Sələfi Salihin ittifaq ilə bu fikirdədirlər ki, Qiyamət günü möminlər öz Rəblərini heç bir əziyyət çəkmədən görəcəklər. Əbu Səid əl-Xudri K rəvayət edir ki, Rəsulullahın 3 zamanında bir qurup insanlar: «Ya Rəsululah! Qiyamət günü Rəbbimizi görəcəyikmi?» Rəsulullah 3 buyurdu: «Yanında bulud olmayan açıq bir havada günəşi görməyə çətinlik çəkirsinizmi? Bədirlənmiş ayı **14-**cü günündə yanında bulud olmayan açıq havada görməyə çətinlik çəkirsinizmi?» Xeyr, Ya Rəsulullah! O, buyurdu: «Günəşi və ayı görməkdə əziyyət çəkmədiyiniz kimi Allahı görməkdə də əziyyət çəkməyəcəksiniz»[374]. Abdullah İbn Qeys K rəvayət edir ki, Rəsulullah 3 buyurdu: «İki Cənnət vardır ki, qabları və içindəki (digər əşyaları) da gümüşdəndir. Digər iki Cənnət daha vardır ki, qabları və içindəki digər əşyaları da qızıldandır. Ədn Cənnətindəki topluluğun Rəblərinə baxmalarının qarşısında Allahın üzündəki o, əzəmət örtüyündən başqa bir şey olmayacaqdır»[375]. Adiy İbn Hatim K rəvayət edir ki, Mən Peyğəmbərin 3 yanında ikən bir nəfər gəlib yoxsulluqdan şikayət etdi. Sonra digər bir nəfər gəldi və yol kəsən quldurlardan şikayət etdi.

---

[371] Buxari, Müslim.
[372] İbn Xuzeyfə «Kitabu Tövhid» 1/348, «Kitabus Sunnə» 1/227.
[373] Geniş Məlumat üçün bax: İbn Qeyyim “Hədiyul Ərvah – Cənnətdəki Həyat”.
[374] Buxari 4581, Müslim 183, Darimi “Sünən” 6/81, H.2804.
[375] Buxari 4878,4879,4880, Müslim 180.

Peyğəmbər: “Ey Adiy! Hirə şəhərini gördünmü?” deyə buyurdu. Adiy: “Xeyr, yalnız eşitdim” dedim. Peyğəmbər: “Əgər ömrün uzun olsa dəvə üzərində bir qadının Allahdan başqa kimsədən qorxmadan Kəbəyə gəlib təvaf edəcəyini görəcəksən” deyə buyurdu. Öz-özümə: “Bizim Tai qəbiləsinin yol kəsənləri varaaa! (Onların əlindən hara gələ bilər)” dedim. Peyğəmbər: “Əgər ömrün uzun olsa Kisranın xəzinələrinin fəth ediləcəyini görəcəksən” deyə buyurdu. Mən: “Kisra İbn Hurmuzmu?” dedim. Peyğəmbər: “Bəli, Kisra İbn Hurmuz və əgər ömrün uzun sürərsə qızıl və gümüş dolu kisəsini çıxarıb zəkat vermək istəyən adamı görürsən. Lakin zəkat alacaq kimsə olmayacaqdır (tapmayacaqdır). Hər biriniz mütləq bir gün gələcək aranızda heç bir pərdə, tərcüməçi olmadan Allahla qarşılaşacaqsınız. O, zaman Allah: “Səni təbliğ edən bir Peyğəmbər göndərmədimmi?” deyə buyuracaq. O: “Bəli, göndərdin” deyəcəkdir. Allah: “Mən sənə mal vermədimmi? Ikram etmədimmi?” deyə soruşacaq. Qul: “Bəli, Ey Rəbbim, verdin” deyib sağına baxacaq Cəhənnəmdən başqa bir şey görməyəcəkdir, soluna baxacaq Cəhənnəmdən başqa bir görməyəcəkdir”. Adiy K deyir ki, Peyğəmbərin 3 belə buyurduğunu eşitdim: “Bir xurmanın yarısı da olsa onu sədəqə verib özünüzü Cəhənnəmdən qoruyun. Kim yarım xurma tapmazsa gözəl bir sözlə qorunsun”. Adiy: “Allahdan başqa kimsədən qorxmadan Kəbəni təvaf etməyə gedən dəvə üstündə yaşlı qadın gördüm. Kisra İbn Hurmuzun xəzinələrini ələ keçirənlər arasında mən də var idim. Əgər sizin də ömrünüz uzun olarsa Əbul Qasımın xəbər verdiyi kisəsini çıxaran o, adamı görəcəksiniz” dedi[376]. Muhəmməd İbn Cəfər əl-Qattani, İmam Suyutidən Σ rəvayət edir ki: “Qiyamət günü Cənnətə möminlərin Rəblərini görmələri ağıl ilə mümkündür, Quran, Sünnə və İcma bunu təsdiq edir. *Quran*: ***«O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23).* ***“Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafat gözləyir...”.*** *(Yunus 25-26).* ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər».*** *(əl-Mutəffifin 15).* ***Sünnə***: Sünnəyə gəldikdə isə **20-**dən çox səhabədən gələn səhih hədislər bunun dəlilidir. ***İcma*****:** Sələf alimləri bidət əhli meydana gəlməmişdən öncə möminlərin Rəbblərini Cənnətdə görmələri üzərinə icma etmişlər[377]. İbn Kəsir Σ deyir ki: ***«O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23).* Onlar (möminlər) açıq-aydın öz Rəbblərini görəcəklər. Onlar öz Rəbblərinə baxacaqlar.

---

[376] Buhari “Mənakib” 25, Fəthul Bâri 6/610-611.
[377] Qattani “Nazmul Mutanasira Minəl Hədis əl-Mutavati”, “Mətailul Musirat”.

